# İman ağacı

**Müəllif: Abdur-Rəhman ibn Nasir əs-Sə'di**

**Tərcümə edən: Aydın Salehli**

## Redaksiya heyəti

**Ə. Z. Musayev**
**M. N. Qarayev**
**S. Z. Səfərbəyov**
**H. N. Mahmudov**

## Kompüter tərtibatı

**Ə. Z. Musayev**
**M. N. Qarayev**


*Şübhəsiz ki, bu tərcümə insan əməyinin bəhrəsidir. Deməк, burada xətaların olması da labüddür. Odur ki, öz düzəlişlərini, qeyd və mülahizələrini aşağıdakı elektron ünvana göndərəcək oxuculara əvvəlcədən təşəkkürümüzü bildiririk. Sizin dəyərli məsləhətləriniz bu kitabın gələcək nəşrlərində mütləq nəzərə alınacaqdır.*


**Bu kitab Azərbaycan Respublikası**
**Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin**
**razılığı ilə çap edilmişdir.**

**(DK-547/B 20.12.2011)**

## Müəllifin müqəddiməsi

İman ağacını ən xeyirli qullarının qəlbində əkən, onu suvaraq faydalı elmlərlə qidalandıran, gecə-gündüz onu zikr etdirən və bol-bol nemətlərlə hər an onun xeyir bərəkətini verən Allaha həmd olsun!

Şəhadət verirəm ki, Allahdan başqa ibadət haqqına layiq məbud yoxdur, O təkdir və Onun şəriki də yoxdur. O Tək olan, hər şeyə Qalib gələn, Səxavətli, Rəhmli və Bağışlayandır. Həmçinin şəhadət verirəm ki, seçilmiş peyğəmbər Muhəmməd ﷺ Onun qulu və elçisidir.

Allahım, Muhəmmədə, onun ailəsinə və səhabələrinə salavat və salam çatdır!

Bu kitab dinin əsas mövzularından, haqqın və yəqinliyin ən böyük əsaslarından olan iman mövzusu ilə bağlıdır. Bu araşdırmanı Uca Allahın Kitabı – Qurani Kərim, habelə Onun Peyğəmbəri Muhəmmədin ﷺ sünnəsi ilə araşdırdıq. Belə ki, Peyğəmbərin ﷺ sünnəsi, Quranı təfsir edərək açıqlayır, onun qısa məzmununu şərh edir və bir çox yığcam ayələrinin təfsilatına varır. Kitabda:

- İlk olaraq imanın açıqlaması qeyd olunur.
- İkinci onun əsasları, qisimləri və nədən qaynaqlandığı açıqlanır.
- Üçüncü isə imanın faydasından və səmərələrindən, habelə bununla bağlı olan əsaslarından bəhs edilir.

Uca Allah buyurur: **"Allahın necə məsəl çəkdiyini görmürsənmi? Gözəl söz (lə ilahə illəllah) kökü *yerdə* möhkəm olan, budaqları isə göyə yüksələn gözəl bir ağac kimidir. O *ağac***

**Rəbbinin izni ilə öz bəhrəsini hər zaman verir. Allah insanlar üçün misallar çəkir ki, bəlkə, düşünüb ibrət alsınlar”.** (İbrahim, 24-25)

Bu ayədə Uca Allah ən gözəl kəlmə olan iman kəlməsini misal göstərərək onu möhtəşəm bir ağaca bənzədir və onu bu cür gözəl vəsf edir: kökü yerdə möhkəm olan, davamlı inkişaf edən, hər zaman və hər an bəhrə verən, öz sahibinə və qeyrisinə hər zaman cürbəcür faydalar və faydalı məhsullar verən bir ağac.

Bu ağac Allahın verdiyi bu vəsflərin miqdarına görə möminlərin qəlbində müxtəlif ölçülərdə olur.

Gərək hər bir müvəffəq insan bunları mənimsəməyə, onun vəsflərinə, səbəblərinə, əsaslarına və fəri məsələlərinə bələd olmağa, həm elmi, həm də əməli cəhətdən onu yaşatmağa səy göstərsin. Çünki insanın bu ağacdan olan payı nə qədərdirsə, dünya və axirətdə əldə edəcəyi xeyir və səadətin payı da o qədər olacaqdır.

## Birinci fəsil
## İmanın tərifi və açıqlaması

Hər bir şeyin əhkamlarından öncə onun tərifi və açıqlaması qeyd olunur ki, onun mahiyyəti aydın olsun. Çünki hər hansı bir şey barəsində verilən hökm həmin şey barəsində müəyyən təsəvvürün bir qoludur. Odur ki, kim bir məsələ barəsində yetərincə elmə yiyələnmədən, onu başqa şeylərdən fərqləndirəcək dərəcədə təsəvvürə sahib olmadan hökm verərsə, çox kobud bir səhvə yol vermiş olar.

**İmanın tərifi və açıqlaması:**

**İman:** Allah və Onun Rəsulu tərəfindən iman gətirilməsi əmr olunan bütün şeyləri qətiyyətlə təsdiq etmək, onları tam olaraq etiraf etmək, həm zahirdə, həm də batində onlara tabe olmağa deyilir.

İman qəlbin təsdiqi və etiqadıdır. O etiqad ki, bədənin və qəlbin əməllərini özündə əhatə edir. Ümumilikdə iman dini tam şəkildə yerinə yetirməyi ehtiva edir.

Bu baxımdan sələf alimləri deyirdilər: "İman: qəlbin və dilin sözü, habelə qəlbin, dilin və bədən üzvlərinin etdiyi əməllərdir."

İman: söz, əməl və etiqaddır. İman itaətlə artır, asiliklə isə azalır.

İman aşağıdakı şeyləri özündə əhatə edir:

1 – Əqidə.

2 – Əxlaq.

3 – Əməl.

Allahın gözəl adlarını, kamil və uca sifətlərini, ad və sifətlərdən qaynaqlanan fellərini təsdiq və etiraf etmək imanın ən əzəmətli əsaslarındandır.

Həmçinin, Allahın həm zahirdə, həm də batində ilahiləşdirilməsi və Ona ibadət olunması kimi xüsusi haqlarını etiraf etmək də imanın əsaslarındandır.

Bundan savayı Allahın Öz mələkləri, ordusu, keçmişdə olmuş və gələcəkdə olacaq yaradılışları barədə verdiyi bütün xəbərləri etiraf etmək və Axirət gününü təsdiqləmək də buna aiddir.

**Bütün bunlar imanın əsaslarındandır:**

Həmçinin Quran və sünnədə gözəl bir şəkildə vəsf olunmuş bütün peyğəmbərlərə – onlara Allahın salavatı və salamı olsun – iman gətirmək lazımdır.

**Bütün bunlar imanın əsaslarındandır:**

Həmçinin imanın əsaslarından:

1 – Allahın vəhdaniyyətini qəbul etmək və ona ibadət etməklə Allahın təkliyini etiraf etmək.

2 – Yalnız heç bir şəriki olmayan Allaha ibadət etmək.

3 – Dini yalnız Allah üçün etmək.

4 – İslamın zahiri qanunlarına və batini həqiqətlərinə əməl etmək.

**Bütün bunlar imanın əsaslarındandır:**

Buna görə də Allah imanı Cənnətə daxil olmaq və Cəhənnəmdən yaxa qurtarmaq üçün səbəb etmişdir.

Həmçinin Uca Allah Öz razılığını, zəfər və xoşbəxtlik qazanmaq üçün imanı səbəb etmişdir.

Bütün bunlar da yalnız qeyd etdiyimiz kimi əqidə, qəlbi əməllər, bədən üzvlərinin əməlləri olduğu təqdirdə baş verir. Bunlardan biri olmadıqda isə naqislik baş verir, savab azalmış olur və müvafiq cəza verilmiş olur.

Uca Allah bildirmişdir ki, kamil iman vasitəsilə insan dünyada ən yüksək məqamlara və axirətdə ən uca mənzillərə nail olur.

Uca Allah buyurur: **“Allaha və Onun elçilərinə iman gətirənlər – məhz onlar doğru olanlardır.”** (əl-Hədid, 19)

Doğru olanlar: Peyğəmbərlərdən sonra dünyada ən yüksək dərəcədə, Axirətdə də ən uca mənzildə olanlardır.

Bu ayədə xəbər verilir ki, kim Allaha və Onun Rəsuluna layiqincə iman gətirərsə bu məqama nail olar.

Bu ayəni aşağıdakı hədis açıqlayır:

Buxari və Muslimin səhih əsərlərində qeyd olunur ki, Peyğəmbər ﷺ demişdir: “Cənnət sakinləri, bir-birilərindən üstün olduqları üçün (onların alt mərtəbədə olanları) üst mərtəbədəki otaqlarda yerləşmiş möminləri, şərq və ya qərb istiqamətində axıb gedən parlaq ulduzu seyr etdikləri kimi seyr edəcəklər.”

Soruşdular: “Ey Allahın rəsulu, məgər o peyğəmbərlərin mənzili deyilmi? Onlara kimsə çata bilərmi?”

Peyğəmbər ﷺ buyurdu: “Bəli, nəfsim Əlində olana and olsun ki, Allaha iman gətirib peyğəmbərləri təsdiqləyən kəslər *onlara çata bilərlər*.”[1]

---

[1] Buxari, 3256; Muslim, 2831. Hədis Əbu Səid əl-Xudrinin ﷺ rəvayətidir.

Onların Allaha iman gətirmələri, həm zahirdə, həm də batində peyğəmbərləri təsdiqləmələri, əqidələri, əxlaqları, əməlləri, Allaha və Onun Rəsuluna kamil şəkildə itaət etmələri və bütün bunları layiqincə yerinə yetirmələri, ayə və hədisdə qeyd olunan, Allaha iman gətirib peyğəmbərləri təsdiqləmələrindən xəbər verir.

Uca Allah Öz Kitabında bu ümumi və hər şeyi əhatə edən imanı, onunla bağlı olan itaəti və təslimçiliyi əmr edərək bunu edənləri tərifləmişdir.

Uca Allah imanla bağlı ən əzəmətli ayələrindən birində buyurur: **"Deyin: "Biz Allaha, bizə nazil olana, İbrahimə, İsmailə, İshaqa, Yaquba və onun nəslinə nazil olana, Musa və İsaya verilənlərə, özlərinin Rəbbi tərəfindən peyğəmbərlərə verilənlərə iman gətirdik. Biz onların arasında fərq qoymuruq. Biz yalnız Ona təslim olanlarıq!"** (əl-Bəqərə, 136)

Uca Allah: **"Biz yalnız Ona təslim olanlarıq"**– deyə buyuraraq qullarına bütün bu böyük əsaslara iman gətirməyi, o cümlədən Allahın nazil etdiyi bütün kitablara, göndərdiyi bütün elçilərə iman gətirməyi, Allaha qarşı ixlaslı (səmimi) olmağı, Ona təslim olmağı və yalnız Ona itaət etməyi əmr edir.

Həmçinin surənin sonunda bunlara əməl edən möminləri təriflәyərək buyurur: **"Peyğəmbər öz Rəbbindən ona nazil edilənə iman gətirdi, möminlər də *iman gətirdilər*. Hamısı Allaha, Onun mələklərinə, kitablarına və elçilərinə iman gətirdilər. *Onlar dedilər*: "Biz Onun elçiləri arasında fərq qoymuruq!" Onlar dedilər: "Eşitdik və itaət etdik! Ey Rəbbimiz! Səndən bağışlanma diləyirik, dönüş də yalnız Sənədir!"** (əl-Bəqərə, 285)

Rəbbimiz bu ayədə xəbər verir ki, Peyğəmbər ﷺ və onunla birlikdə olan möminlər bu əsaslara iman gətirmiş, peyğəmbərlərin arasında heç bir fərq qoymayaraq onların hamısına iman gətirmiş və onların Allah tərəfindən gətirdiklərini təsdiqləmişlər.

Onlar **"Eşitdik və itaət etdik!"**– deməklə itaət etmiş, Uca Allahdan bu ibadətdə onlara yardımçı olmağı diləmiş və imanın haqlarında yol verdikləri bəzi səhvləri əfv etməsini istəmişlər.

Əvvəl-axır məxluqatın hamısının dönüş yeri Allahadır və O, imanın əməl olunmuş və olunmamış haqlarına görə insanlara bunun əvəzini verəcəkdir.

Uca Allah İsanın və digər peyğəmbərlərin ardıcıllarının belə dediyini buyurur: **"Ey Rəbbimiz! Biz sənin nazil etdiyinə iman gətirdik və *göndərdiyin* elçinin ardınca getdik. Bizi də şahidlərlə bir yerdə yaz!"** (Ali İmran, 53)

Onlar qəlbləri ilə həm iman gətirmiş, həm də ona riayət etmiş, bədən üzvləri ilə itaət etmiş, Allahdan da onları Onun təkliyinə şahid olan *tövhid əhli* ilə birlikdə yazmalarını və onları dildə, əməldə və etiqadda tövhidi həyata keçirənlərdən etmələrini diləmişlər.

Uca Allah buyurur: **"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar, yalnız öz Rəbbinə təvəkkül edər, namaz qılar və Bizim onlara verdiyimiz ruzidən *Allah yolunda* xərcləyərlər. Məhz onlar həqiqi möminlərdir. Onlar üçün Rəbbi yanında dərəcələr, bağışlanma və bolluca ruzi vardır."** (əl-Ənfal, 2-4)

Bu ayədə Uca Allah möminləri dinin həm zahirdə, həm də batində olan əsas və fəri məsələlərinə əməl etmələri ilə vəsf etmişdir.

Rəbbimiz onları əlamətləri zahiri və batini əqidələrində, habelə, söz və əməllərində təzahür edən imanla vəsf etmişdir.

İman onların qəlblərində qərar tutduqca və Allahın ayələri oxunduqca onların imanı artar, hər dəfə Allah anıldığı zaman onların qəlbi qorxuya düşər.

Onlar həm qəlblərində, həm də gizlində Allaha təvəkkül edər, bütün işlərində yalnız Ona etimad göstərər və işlərini Ona həvalə edərlər.

Bununla yanaşı onlar həm zahirdə və həm də batində olmaqla fərz və nafilə namazlarını qılarlar.

Həmçinin zəkat verər, vacib və müstəhəb sədəqələr ödəyərlər.

Kim bu vəsflərə malik olmuş olsa hər bir xeyrə yiyələnmiş və hər bir şərdən uzaqlaşmış olar. Buna görə də Uca Allah ayənin sonunda belə buyurur: **"Məhz onlar həqiqi möminlərdir."** Yəni həqiqətdə bu vəsfə yalnız onlar layiqdirlər. Çünki onlar zahirdə və batində həmin əməlləri layiqincə yerinə yetirirlər. Sonra Uca Allah onlara veriləcək mükafatları sadalayır:

1 – Hər bir şəri dəf edən bağışlanma.

2 – Allah yanında yüksək dərəcələr.

3 – Bol ruzi. Elə bir ruzi ki, onu heç bir göz görməmiş, heç bir qulaq onun barəsində eşitməmiş, hətta heç kəsin ağlına belə gəlməmişdir.

- Uca Allah buyurur: **"Möminlər həqiqətən də nicat tapmışlar; o kəslər ki, namazlarında mütidirlər, o kəslər ki, sözbazlıq-**

**dan qaçırlar, o kəslər ki, zəkat verirlər, o kəslər ki, öz cinsi orqanlarını *həmişə* qoruyurlar, zövcələri və sahib olduqları cariyələr istisnadır. Onlar *buna görə heç* qınanmazlar. Bundan artığına can atanlar isə həddi aşanlardır. O *mömin* kəslər ki, əmanətlərini və vədlərini qoruyurlar. O kəslər ki, namazlarını öz vaxtlarında qılırlar. Məhz onlar – varis olanlardır. O kəslər ki, Firdovs cənnətinə varis olacaqlar; onlar orada əbədi qalacaqlar."** (əl-Muminun, 1-11)

Uca Allah bu ayələrdə imanı bütün bu xüsusiyyətlərlə vəsf etmişdir.

Əvvəlcə O, möminlərin nicata çatdıqlarını xəbər verir, sonra onları vəsf edərək buyurur: **"O kəslər ki, namazlarında mütidirlər..."** və digər vəsflər. Bütün bu vəsfləri özündə daşıyan kəslər əsl mömindir.

Əsl mömin dedikdə həm zahirdə, həm də batində vaciblərə əməl edib, məkruh və haramlardan çəkinənlər qəsd olunur. Məhz kamil iman sayəsində onlar Cənnətin ən yüksək təbəqəsi olan Firdovs cənnətlərinə varis olacaqlar. Bununla yanaşı onlar ən yüksək kamilliyə də nail olmuş hesab olunurlar.

Bununla açıq-aydın görünür ki, iman aşağıdakılara şamil olunur:

1 – Dini etiqadlar.

2 – Əxlaq.

3 – Zahiri və batini əməllər.

Onu da bilmək lazımdır ki, bu vəsflərin artması ilə iman da artır, azalması ilə də azalır. İnsanların bu vəsflərə az və ya çox yiyələnmələrinə görə imanları da müxtəlif dərəcələrdə olur.

Beləliklə insanlar üç dərəcədə olurlar:

1 – Allaha yaxın olmaqla *xeyir işlərdə* bir-birilərini ötüb keçənlər: Bunlar vaciblərə və müstəhəblərə əməl edib, haram, məkruh və gərəksiz mübahları tərk edənlərdir.

2 – Orta yolda olanlar: Bunlar yalnız vacibatları yerinə yetirib, haramları tərk edənlərdir.

3 – Özlərinə zülm edənlər: Bunlar imanın bəzi vaciblərini tərk edib, bəzi haramlara yol verənlərdir.

- Uca Allah bu üç sinfi xatırladaraq buyurur: **"Sonra, Kitabı qullarımız içərisindən seçdiklərimizə miras etdik. Onlardan kimisi özünə zülm edər, kimisi orta yol tutar, kimisi də Allahın izni ilə yaxşı işlərdə öndə gedər. Böyük lütf də budur."** (Fatir, 32)

Bəzən Uca Allah saleh əməlləri, təqvanı və səbri imana bağlayır ki, heç kəs imanın yalnız qəlbdə olduğu qənaətində olmasın.

Quranda bir çox yerlərdə buyurulur ki: **"İman gətirib xeyirxah əməllər işləyənlər..."** (əl-Kəhf, 107). Sonra həmin xeyirxah əməllər barəsində xəbər verilir. Beləliklə, saleh əməllər imandandır və imanın vaciblərindəndir. Elə yaxşı əməllərin sayəsində iman mövcud olur.

Kim Allahın və Onun rəsulunun əmr etdiyi vacib əməllərə riayət etmədən və haram buyurduqlarından da çəkinmədən mömin olduğunu iddia edərsə, həmin kəs imanında sadiq deyildir. Belə ki, imanla təqva bir-birinə bağlıdır.

Uca Allah buyurur: **"Şübhəsiz ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar kədərlənməyəcəklər. Onlar iman gətirmiş və *Allahdan* qorxmuşlar."** (Yunus, 62-63)

Qeyd olunur ki, iman qəlbdəki etiqadlara, yaxşı niyyətlərə və saleh əməllərə şamil olunur.

Buna da mömin yalnız Allahın qəzəbinə səbəb olan küfr, fasiqlik və asiliklərdən uzaq olmaqla nail ola bilər. Buna görə də Uca Allah buyurur: **"və *Allahdan* qorxmuşlar."**

- Digər ayədə Uca Allah ən xeyirli insanları vəsf edərək buyurur: **"Bilin ki, Allahın Elçisi aranızdadır. Əgər o, bir çox işlərdə sizə güzəştə getsəydi, çətinliyə düşərdiniz. Lakin Allah sizə imanı sevdirmiş, onu qəlbinizə gözəl göstərmiş, sizdə küfrə, günaha və asi olmağa qarşı nifrət oyatmışdır. Doğru yolda olanlar da bunlardır. Bunlar Allahın lütfü və neməti sayəsindədir. Allah Biləndir, Müdrikdir."** (əl-Hucurat, 7-8).

Bu Uca Allahın ən böyük lütflərindəndir ki, O, imanı insana sevdirir, onu insanın qəlbinə gözəl göstərir, imanın şirinliyini ona daddırır, onun bədən üzvlərini İslamın qanunlarına riayət etməyə yönəldir, Allahın haram buyurduqlarına qarşı onda nifrət yaradır. Həqiqətən, Allah kimlərin bu fəzilətə layiq olmasını daha yaxşı biləndir və bu neməti kimlərə bəxş etməsində də hikmət sahibidir.

- Buxarinin "Səhih" əsərində Ənəsdən ﵁ nəql olunur ki, Peyğəmbər ﷺ demişdir: "Üç xislət vardır ki, bunlar kimdə olsa, o kimsə bu xislətlər sayəsində imanın şirinliyini dadmış olar: Allahı və Onun elçisini başqalarından daha çox sevmək, sevdiyi kimsəni yalnız Allah üçün sevmək, Allah onu küfrdən qurtardıqdan sonra yenidən küfrə qayıtmağı, oda atılmağı xoşlamadığı kimi, xoşlamamaq."[1]

---

[1] Buxari, 16; Muslim, 43, 67; Tirmizi, 2624; Nəsai, 8/78; İbn Macə, 4033.

Bu hədisdə Peyğəmbər ﷺ, imanın əsası olan Allah və Rəsulunu ﷺ sevməyi qeyd edərək bildirir ki, sadəcə olaraq sevmək bəs eləmir. Gərək Allaha olan sevgi bütün digər sevgilərə olan sevgini üstələsin və Allah üçün sevib, Onun üçün də nifrət edəsən. Həmçinin mömin olan kəs peyğəmbərləri, şəhidləri, siddiqləri və əməlisalehləri sevməlidir. Çünki onlar Allahı layiqincə sevmiş və Allah da onları məxluqatın arasından seçmişdir. Sonra hədisdə imanı pozan və onu inkar edən əməli dəf etmək zikr olunur. Belə ki, mömin olan kəs oda atılmağı xoşlamadığından daha da çox dinindən dönməyi xoşlamamalıdır.

Hədisdə həmçinin bildirilir ki, qəlbdə imanın şirinliyi vardır. İnsan həmin şirinliyi hiss edərsə digər dünyəvi sevgilər və nəfsi istəklər gözündən düşər və gözəl bir həyata qədəm qoyar.

Şübhəsiz ki, Allah və Rəsulunu sevən kəs daim Allahı zikr etməklə məşğul olar. Çünki insan bir şeyi çox sevdikdə onu çox anar. Beləliklə də Allah və rəsulunu sevən onlara tabe olur və bunu hər şeyə, o cümlədən nəfsin istəklərinə tərcih edir.

Belə olan şəxsin qəlbi rahatlıq tapır, itaətlərlə bəzənir, qəlbi İslam üçün açılır və Rəbbi tərəfindən əta edilən nur üzərində olur.

Bir çox möminlər bu uca məqama çata bilmirlər. Uca Allah buyurur: **“Hər kəsin etdiyi əməllərə görə dərəcələri vardır.”** (əl-Ənam, 132)

Buxari və Muslimin "Səhih" əsərlərində Əbu Hureyradan ؓ Peyğəmbərin ﷺ belə buyurduğu rəvayət olunur: “İman yetmiş və bir neçə şöbədən ibarətdir, ən yüksəkdə olanı “Lə ilahə illəllah” kəlməsi, ən aşağıda olanı isə yoldakı əziyyət verici bir şeyi aradan qaldırmaqdır. Həya da imanın bir şöbəsidir.”[1]

---

[1] Buxari, 9; Muslim, 57, 35; Əbu Davud, 4676; Tirmizi, 2614; Nəsai, 8/96; Əhməd, 2/414.

Bu hədisdə göstərilir ki, iman dillə deyilən sözlərə, bədən üzvləri ilə yerinə yetirilən əməllərə, etiqadlara, əxlaqi keyfiyyətlərə, Allahın haqlarının ödənilməsinə və məxluqlara qarşı yaxşılıq etmək kimi əməllərə də şamil olunur.[1]

---

[1] Qazı İyad ﷺ demişdir: "Bəzi alimlər ictihad edib burada bəhs edilən imanın şöbələrini sadalamağa çalışmışlar. Lakin hədisdə qəsd edilənin məhz bunlar olduğunu söyləmək çox çətindir. Burada sayı göstərilən şöbələri izahlı şəkildə bilməmək imana xələl gətirməz".

Alimlərin bu xüsusda söylədiklərini bir araya gətirərək imanın şöbələrini aşağıdakı şəkildə açıqlayıram. Bu şöbələr qəlbin, dilin və bədənin əməlləri olaraq üç qismə bölünür:

**I. Qəlbin əməlləri:** qəlbə aid olan əməllər etiqad və niyyətlə bağlı xüsusları əhatə edir. Bu qismə iyirmi dörd xislət aiddir.

1. Allaha iman gətirmək; Allahın zatına, sifətlərinə, Tək olduğuna, Onun heç bir bənzəri olmadığına, Ondan başqa hər bir şeyin yaradılmış olduğuna iman gətirmək də buna aiddir.

2. Mələklərə iman gətirmək;

3. *Allahın nazil etdiyi* kitablara iman gətirmək;

4. *Allahın göndərdiyi* peyğəmbərlərə iman gətirmək;

5. Qədərə – xeyir və şərin Allahdan olmasına iman gətirmək;

6. Axirət gününə iman gətirmək; Qəbirdə sorğu-sual olunmağa, öldükdən sonra dirilməyə, məhşərə toplanmağa, haqq-hesaba çəkilməyə, tərəziyə, qıl körpüsünə, Cənnət və Cəhənnəmə iman gətirmək də buna aiddir.

7. Allahı sevmək;

8. Allah üçün sevmək və Allah üçün qəzəblənmək;

9. Muhəmməd Peyğəmbəri ﷺ sevmək və onun böyüklüyünü qəbul etmək; Peyğəmbərə ﷺ salavat gətirmək və onun yolunu tutub getmək də buna aiddir.

10. İxlas. Riyanı və nifaqı tərk etmək də buna aiddir;

11. Tövbə etmək;

12. *Allahdan* qorxmaq;

13. *Allahın mərhəmətinə* ümid bəsləmək;

14. Şükür etmək;

15. Vəfalı olmaq;

16. Səbir etmək;

17. Qəzavü-qədərə razı qalmaq;

18. *Allaha* təvəkkül etmək;

19. Rəhmli olmaq;

20. Təvazökar olmaq; Böyüyə hörmət etmək və kiçiyə mərhəmət göstərmək də buna aiddir.

21. Təkəbbürlü olmaqdan və özünü bəyənməkdən çəkinmək;

22. Həsəd və paxıllıqdan həzər etmək;

23. Kin saxlamamaq;

24. Qəzəblənməmək;

**II. Dilin əməlləri.** İmanın bu qismi yeddi növdür:

1. Tövhid kəlməsini tələffüz etmək;

2. Quran oxumaq;

3. *Faydalı* elm öyrənmək;

4. *Faydalı* elm öyrətmək;

5. Dua etmək;

6. Zikr etmək. Allahdan bağışlanma diləmək də buna aiddir;

7. Boş sözlər danışmaqdan çəkinmək;

**III. Bədənin əməlləri.** İmanın bu qismi otuz səkkiz növdür:

a) Bunlardan on beşi insanın şəxsən özünə aiddir:

1. Zahirən və batinən təmizlənmək; Murdar şeylərdən təmizlənmək də buna aiddir.

2. Ayıb yerləri örtmək;

3. Fərz və nafilə namazlarını qılmaq;

4. Zəkat vermək;

5. Qul azad etmək;

6. Comərd olmaq; *Allah yolunda* yemək vermək və qonağa hörmət etmək də buna aiddir.

7. Fərz və nafilə oruclarını tutmaq;

8. Həcc və ümrə ziyarətlərini yerinə yetirmək;

9. Kəbəni təvaf etmək;

10. Etikaf etmək, (Ramazan ayının axırıncı on gününü məsciddə qalmaq);

11. Qədr gecəsini axtarmaq;

12. Dinini fitnələrdən qorumaq; Allaha şərik qoşulan diyardan hicrət etmək də buna aiddir.

13. Nəzir etdikdə, onu yerinə yetirmək;

14. Andları pozmamaq;

15. Kəffarələri (günahın bağışlanılması üçün şəriətin buyurduğu qaydada müəyyən edilmiş müəyyən cəriməni) ödəmək;

b) Bunlardan altısı isə insanın tabeçiliyində olanlara qarşı münasibətdə yerinə yetirməsi gərəkli olan əməllərdir:

16. Evlənmək vasitəsilə iffəti qorumaq;

17. Ailəni dolandırmaq;

18. Valideynlərin qayğısına qalmaq və onlara asi olmamaq;

19. Uşaqları tərbiyə etmək;

20. Qohumluq əlaqələrini möhkəmləndirmək;

21. Ağaya itaət etmək, habelə kölələrlə mülayim rəftar etmək;

c) Bunlardan on yeddisi isə topluma qarşı yerinə yetirilməsi gərəkli olan əməllərdir:

22. Ədalətlə hökm vermək;

23. İxtiyar sahiblərinə itaət etmək;

24. İnsanların arasını düzəltmək. Xəvariclərlə, habelə yolunu azmış digər firqələrlə mübarizə aparmaq da buna aiddir;

25. Xeyirxah işlərdə bir-birinə yardım etmək. Yaxşılığı əmr etmək və pis işlərdən çəkindirmək də buna aiddir;

26. Şəriətin qoyduğu cəzaları yerinə yetirmək;

27. Cihad etmək. *İslam ölkəsinin* sərhədlərini qorumaq da buna aiddir;

28. Əmanətə xəyanət etməmək. Əldə edilmiş qənimətlərin beşdə birini beytülmala qoymaq;

Bu hədisdə həmçinin imanın ən yüksək mərtəbəsi, onun əsası və qaydası olan "Lə iləhə illəllah" kəlməsini səmimi qəlbdən deyib buna etiqad etmək və ən aşağı mərtəbəsi olan yoldakı sümük, tikan və bu kimi əziyyət verici hər hansı bir şeyi aradan qaldırmaq qeyd olunur. Həyalı olmaq isə məxsusi olaraq qeyd olunur. Çünki həyanın sayəsində iman mövcud olur, məhz onun vasitəsilə insan hər bir xoşagəlməz əməli tərk edir və onun sayəsində hər bir gözəl əxlaq həyata keçirilir.

Hədisdə qeyd olunan bu şöbələr dinin həm zahirdə, həm də batində olan bütün qanunlarını ehtiva edir.

Bu da açıq-aydın göstərir ki, insan bu şöbələrə nə qədər çox yiyələnirsə, bir o qədər də imanı artır *və əksinə nə qədər az yiyələnirsə, bir o qədər də* azalır. Məlumdur ki, insanlar imanın artıb-azalması məsələdə bir-birilərindən müxtəlif dərəcədə fərqlənirlər.

---

29. Borc vermək, habelə borc aldıqda onu qaytarmaq;
30. Qonşuya yaxşılıq etmək;
31. İnsanlarla gözəl rəftar etmək;
32. Halal yolla var-dövlət qazanmaq və bunu lazımi yerlərə (faydalı işlərə) xərcləmək;
33. İsraf etməmək;
34. Verilən salamı almaq;
35. Asqırıb "əlhəmdulilləh" deyənə "yərhəmukəllah" demək;
36. İnsanlara əziyyət verməmək;
37. Boş söhbətlərdən və faydasız işlərdən qaçmaq;
38. Əziyyət verən bir şeyi yoldan kənar etmək.

Bunların cəmi altmış doqquz edir. Lakin yuxarıda iki-iki zikr edilmiş xislətləri tək-tək sadalamaqla onların sayını yetmiş doqquza çatdırmaq mümkündür. ("Fəth əl-Bari", 1/73-74)

Kim imanın artıb azalmadığını etiqad edərsə, şəriətin dəlilləri ilə bərabər reallığa qarşı da çıxmış olur.

Peyğəmbər ﷺ İslam və iman barəsində məşhur Cəbrail hədisində də söhbət açmışdır. Həmin hədisdə bildirilir ki, Cəbrail səhabələrin önündə ondan iman barəsində soruşduqda o belə buyurur: "İman odur ki, Allaha, Onun mələklərinə, kitablarına, elçilərinə və Axirət gününə iman gətirəsən, habelə qədərə – onun xeyrinə və şərinə iman gətirəsən."[1]

Qeyd olunduğu kimi İslam beş zahiri qanunla açıqlanmışdır. Belə ki, imanla islam kəlmələri birlikdə işləndikdə iman qəlbdəki dini etiqadlar, islam isə zahiri qanunlar kimi şərh olunur. Ayrılıqda mütləq bir şəkildə qeyd olunduqda isə iman bütün bu sadalananlara şamil olunur.

- Buxari və Muslimin "Səhih" əsərlərində Ənəsdən ﵁ Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: "Sizdən biriniz məni öz valideynindən, övladından və bütün insanlardan çox sevməyincə iman gətirmiş olmaz."[2]

Peyğəmbər ﷺ xəbər vermişdir ki, iki məhəbbət bir-birinə zidd olduğu zaman kim Peyğəmbərin ﷺ sevdiyi şeyi öndə tutarsa imanında sədaqətli sayılar. Əks təqdirdə həmin şəxsin imanı naqis hesab olunur. Uca Allah buyurur: **"Xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca iman gətirmiş olmazlar."** (ən-Nisa, 65).

---

[1] Muslim, 8; Əbu Davud, 4695; Tirmizi, 2610; Nəsai, 8/88; İbn Macə, 63; Əhmə, 1/28. Hədis Ömər ibn Xəttabdan ﵁ rəvayət olunmuşdur.

[2] Buxari, 15; Muslim, 70, 44.

Rəbbimiz bəyan edir ki, baş verən ixtilaflarda Peyğəmbəri ﷺ hakim təyin etməyənlər, sonra da onun verdiyi hökmlərindən heç bir sıxıntı duymayanlar, onun əmrlərinə tam bir əminliklə itaət etməyənlər və hökmündən səmimi qəlbdən razı qalmayanlar iman gətirmiş hesab olunmurlar. Bu dinin əsas və fəri məsələlərinə, habelə ümumi və cüzi məsələlərinə də şamil olunur.

- Buxari və Muslimin "Səhih" əsərlərində Ənəsdən ﵁ Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “Biriniz özünə istədiyini qardaşına da istəməyincə iman gətirmiş olmaz.”[1]

Hədisdən belə başa düşülür ki, imanı olan kəs gərək müsəlman qardaşlarının ümumi və xüsusi haqlarını ödəmiş olsun, çünki bu imandan sayılır.

Bunu etməyən və özünə istədiyini qardaşı üçün istəməyən vacib buyurulan şəkildə iman gətirmiş sayılmaz. Həmin haqları nə qədər naqis ödəyərsə bir o qədər də imanı naqis olar.

- Muslimin “Səhih” əsərində Abbas ibn Abdul-Muttalibdən ﵁ rəvayət olunur ki, Peyğəmbər ﷺ demişdir: “Allahın Rəbb, İslamın din və Muhəmmədin peyğəmbər olduğundan razı qalan kimsə imanın tamını dadmış olar.”[2]

Bunlardan razı qalan hər kəs gərək buna görə sevinsin və Allahın rəbb olmasından, işlərini sahmana salmasından sevinc duysun. İslamdan da bir din kimi razı qalaraq bundan fərəh duysun, Allahın onu ən böyük neməti olan İslam dininə müvəffəq etdiyinə görə Ona şükür etsin və Muhəmmədin ﷺ də peyğəmbərliyindən razı qalsın. Çünki o, məxluqatın ən kamili, bü-

---

[1] Buxari, 13; Muslim, 71; Tirmizi, 2515; Nəsai, 8/101; İbn Macə, 76; Əhməd, 3/177.

[2] Muslim, 34; Tirmizi, 2623.

tün kamillik sifətlərində insanlardan ən üstün olanıdır. Onun ümməti isə digər ümmətlər arasında ən yüksəkdə duran, dünya və axirətdə də ən yüksəkdə olan bir ümmətdir. Peyğəmbərdən ﷺ, onun gətirdiklərindən, onun ardıcıllarından razı qalmaqla insan həqiqi imana nail olur və onun şirinliyini dadmış olur.

Uca Allah buyurur: **"Allah möminlərə, öz aralarından onlara *Allahın* ayələrini oxuyan, onları *günahlardan* təmizləyən, onlara Kitabı və Hikməti öyrədən bir Elçi göndərməklə mərhəmət göstərmişdir. Halbuki əvvəllər onlar açıq-aydın azğınlıqda idilər."** (Ali İmran, 164)

Başqa bir ayədə isə belə buyurur: **"Sizə özünüzdən elə bir Elçi gəldi ki, sizin əziyyətə düşməyiniz ona ağır gəlir. O sizə qarşı qayğıkeş, möminlərə şəfqətli, rəhmlidir."** (Tövbə, 128)

Belə olduğu halda mömin qayğıkeş, şəfqətli və rəhmli olan bir Peyğəmbərdən ﷺ necə narazı qala bilər. Axı Uca Allah onun barəsində and içmişdir ki, həqiqətən o çox böyük bir əxlaqa sahibdir. İnsan üçün ən şərəfli məqam onun Allaha qul olması, peyğəmbərinə tabe olması, onu sevib itaət etməsidir ki, bu da Allaha qarşı olan sevginin təzahürlərindəndir. Bu olduqda sevgi və iman da olur. Uca Allah buyurur: **"De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah Bağışlayandır, Rəhmlidir."** (Ali İmran, 31)

- Muslimin "Səhih" əsərində Sufyan ibn Abdullah əs-Səqəfidən ﷺ belə rəvayət olunur: "Bir dəfə mən *Peyğəmbərə* ﷺ dedim: "Ey Allahın rəsulu! Mənə İslamdan elə bir söz söylə ki, artıq səndən sonra heç kəsdən bu haqda soruşmayım." Peyğəmbər ﷺ dedi: "Allaha iman gətirdim" de, sonra da düz yol tut."[1]

---

[1] Muslim, 38; Tirmizi, 2410; Nəsai, 11489; İbn Macə, 3972; Əhməd, 3/413.

Bununla Peyğəmbər ﷺ böyük bir tövsiyəni aydınlaşdırmış olur. İnsan həm zahirdə, həm də batində iman gətirərək, sözdə, əməldə, əmrlərə əməl etməkdə və qadağaları tərk etməkdə doğru yola yönələrsə əməlləri kamilləşər və doğru yola müvəffəq olar.

Ümid edirik ki, bunları edən kəs Allahın aşağıdakı ayəsində qəsd olunanlardan olsun: **"Həqiqətən də: "Rəbbimiz Allahdır!"– deyib sonra düz yol tutan kəslərə mələklər nazil olub** ***deyirlər:*** **"Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin! Biz dünya həyatında da, axirətdə də sizin dostlarınızıq. Orada sizin üçün nəfsinizin çəkə biləcəyi hər şey hazırlanmışdır. Orada istədiyiniz hər şey vardır."** (Fussilət, 30-31)

- Buxari və Muslimin İbn Abbasdan رضي الله عنهما rəvayət etdikləri hədisdə belə deyilir: "Abdul-Qeys *qəbiləsinin* nümayəndələri Peyğəmbərin ﷺ yanına gəldikdə dedilər: "Bizə (haqqı batildən ayırd edən) bəlli bir şey əmr et ki, onu geridə qalanlarımıza xəbər verək, onun sayəsində Cənnətə girək." Onlar Peyğəmbərdən ﷺ içkilər barədə də soruşdular. Peyğəmbər ﷺ onlara dörd şeyi əmr etdi, dörd şeyi qadağan etdi. Onlara Tək Allaha iman gətirməyi əmr etdikdən sonra soruşdu: "Bilirsinizmi, Tək Allaha iman gətirmək nə deməkdir?" Onlar: "Allah və Onun rəsulu daha yaxşı bilir!"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "(Bu) – şəriki olmayan Tək Allahdan başqa (ibadətə haqqı olan) heç bir məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şəhadət vermək, namaz qılmaq, zəkat vermək, Ramazan orucunu

tutmaq və qənimətlərdən beşdə birini (xüms[1]) verməyinizdir." (Peyğəmbər ﷺ) onlara dörd şeyi – həntəmi[2], dubbanı[3], nəqiri[4] və müzəffəti (yaxud müqəyyəri)[5] qadağan etdi. Sonra dedi: "Buyurduqlarımı yadda saxlayın və bunları özünüzdən sonra gələnlərə xəbər verin."[6]

Bu hədis açıq-aşkar sübutdur ki, namaz, zəkat, oruc və qənimətin beşdə birini vermək kimi zahiri şəriət qanunları imandandır.

Bütün bunlar imanı bizə elə bir şəkildə açıqlayır ki, bununla *iman barəsində olan* bütün dolaşıqlar aradan qalxır. Belə ki, qəlbi etiqadlar imana daxil olduğu kimi, bədən üzvləri ilə edilən əməllər də imana daxildir.

Beləliklə insanı Allaha yaxınlaşdıran hər bir söz, əməl və etiqadlar imandan hesab olunur.

---

[1] Xüms – hərbi qənimətlərin beşdə bir hissəsi. Bu bir hissə yenə də beş hissəyə bölünür və sonra onun beşdə bir hissəsi müsəlman hökmdarının əlində qalır, qalan beşdə dörd hissə isə Quran bölgüsünə uyğun olaraq Muhəmməd Peyğəmbərin ﷺ qohumları – Haşimin zürriyyəti, yetimlər, kasıblar və ehtiyac içində olan müsafirlər arasında paylanır.

[2] Həntəm – tərkibinə yun və qan qatılmış gildən düzəldilmiş yaşıl rəngli cürdək. Əvvəllər bu cür qablarda şərab saxlayardılar.

[3] Dubba – şərab saxlamaq üçün qurudulmuş boranıdan düzəldilmiş qab.

[4] Nəqir – şərab saxlamaq üçün içi oyulmuş xurma kötüyündən düzəldilmiş qab.

[5] Müzəffət, yaxud müqəyyər – şərab saxlamaq üçün yanları qatranla malanmış qab.

[6] Buxari, 53; Muslim, 24,17; Əbu Davud, 4677; Tirmizi, 2611; Nəsai 8/105; Əhməd, 1/228.

- Əbu Davudun "Sünən" əsərində Əbu Ümamədən ﷺ Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: "Kim Allah üçün sevib, Allah üçün nifrət edib, Allah üçün verib, Allah üçün saxlayarsa imanı kamil olar."[1]

Sevgi və nifrət qəlbdə və batində olur, vermək və saxlamaq isə zahirdə olur.

Bunların hər birini etdikdə imanın ruhu və məğzi olan ixlasın olması şərtdir.

**Allah üçün sevmək:** Yəni Allahı, Onun sevdiyi əməlləri, vaxtları, zamanları və halları sevmək, habelə Onun sevdiyi peyğəmbərləri və onların ardıcıllarını sevmək.

**Allah üçün nifrət etmək:** Yəni küfr, fasiqlik və asilik kimi Allahın nifrət etdiyi bütün əməllərə, bunları edənlərə və bunlara səsləyənlərə nifrət etmək.

**Allah üçün vermək:** Burada Allahın verilməsini əmr etdiyi hər bir şeyi öz istəyi ilə vermək nəzərdə tutulur. Uca Allah buyurur: **"Kim *haqqını* verir və *Allahdan* qorxursa, və ən gözəl olan *"lə ilahə illəllah" kəlməsini* təsdiq edirsə, Biz onu ən asan olana nail edəcəyik."** ( əl-Leyl, 5-7)

Burada Allahın insana verdiyi bütün əmrlər qəsd olunur və yalnız maddi sərvətdən sərf etmək nəzərdə tutulmur. Əksinə, maddi sərvətlər "vermək" anlayışının bir hissəsidir. Bunun əksi olan verməyib saxlamaq da belədir.

[1] Əbu Davud, 3681. Albani bu hədisi səhih hesab etmişdir. "Sahih əl-Cami" əsəri, 5841.

**Bu dörd şeyə əməl etməklə insanın dini və imanı tamamlanmış olur:**

Tirmizi və Nəsai Əbu Hureyradan ﵁ Peyğəmbərin ﷺ belə dediyini rəvayət etmişdir: "Mömin o kəsdir ki, insanlar öz qanlarını və mallarını ona etibar etsinlər."[1]

Bu hədis dəlildir ki, səhih iman, sahibini əmanəti qorumağa və xəyanət etməməyə sövq edir ki, insanlar ondan arxayın olsunlar və malik olduqları ən qiymətli şeyləri qanlarını və mal-dövlətlərini ona etibar etsinlər.

Bütün bu dəlillər imanın mənasını və həqiqətini aydınlatmış olur. Həsən və qeyriləri bu barədə belə demişlər: "İman təmənna və var-dövlətlə əldə olunmur, iman qəlbdə qərar tutur və əməllər də onu təsdiqləyir."

Yəni zahiri və batini əməllər imanı təsdiq edir və onun sayəsində mövcud olur.

- Uca Allah bu barədə buyurur: **"Hər kəs Allaha iman gətirsə, Allah onun qəlbini haqqa yönəldər."** (Təğabun ,11)

İnsanın başına hər hansı bir müsibət gəldikdə o iman gətirsə ki, həmin müsibət Allah tərəfindəndir, Allah Öz əzəli hökmündə hikmətli, rəhimlidir və O Öz qullarına nəyin daha xeyirli olduğunu biləndir, onda Allah onun qəlbinə razılıq, səbir, təslim və rahatlıq üçün xüsusi hidayət verər.

- Uca Allah buyurur: **"İman gətirib saleh əməllər işlədənləri Rəbbi imanlarına görə doğru yola yönəldər."** (Yunus, 9)

Ayə ümumi şəkildə olduğu üçün onu göstərir ki,  Uca Allah iman əhlini məhz imanlarına görə hər bir xeyirli əməli yerinə yetirməyə və hər bir şər əməldən çəkinməyə yönəldər.

---

[1] Tirmizi, 2636; Nəsai, 5005. Albani bu hədisi səhih hesab etmişdir. "Sahih əl-Cami" əsəri, 6534.

Əməllər bir tərəfdən imandandır, digər tərəfdən isə imanın səmərələrindəndir. Müvəffəq edən isə yalnız Allahdır.

- Uca Allah buyurur: **"Allah sizin imanınızı puç etməz. Həqiqətən də, Allah insanlara qarşı Şəfqətlidir, Rəhmlidir."** (Bəqərə, 143)

Əksər təfsirçilər ayədəki iman kəlməsini müsəlmanların nəsx olunmamışdan öncə Beytül Məqdisə tərəf qıldıqları namaz kimi açıqlamışlar. Belə ki, bir sıra müsəlmanlar qiblə Məscidül Hərama tərəf yönəlməmişdən öncə dünyalarını dəyişmişdilər. Onların aqibəti barəsində bəzi müsəlmanlarda anlaşılmazlıq yarandıqda Uca Allah bu ayəni nazil etmişdi.

Çünki o zaman onların Beytül Məqdisə tərəf yönələrək qıldıqları namaz Allaha və Rəsuluna etdikləri itaətdən irəli gəlirdi ki, bu da imanın elə özüdür.

**Bu ayədən hansı faydalar götürülür:**

**Böyük müjdə:** Uca Allah az və ya çox olmasından asılı olmayaraq möminlərin imanını əsla itirən deyildir. Buxari və Muslimin rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ demişdir: "Qəlbində xardal dənəsi ağırlığından daha az imanı olan kəsi Allah Cəhənnəm odundan çıxaracaqdır."[1]

Bu müjdə Allaha və Onun Rəsuluna itaət məqsədilə edilən hər bir əməl sahibi üçündür. Həmin şəxs bu əməli öz yozumu ilə etdikdə, əməldə səhvə yol verdikdə və ya həmin əməl nəsx olunduqda belə bu qeyd olunduğu kimidir. Çünki o həmin əməli Allaha iman gətirərək, Ona itaət etmək məqsədilə etmiş

---

[1] Buxari, 7439; Muslim, 302, 183.

və sadəcə ictihadında səhv etdiyinə görə onun bu xətası bağışlanır. Çünki insan həmin əməli Allaha tərəf yönəlmək və Ona itaət etmək məqsədilə etdiyinə görə Uca Allah onun bu niyyətinə görə qazandığı savabı əsla itirmir. Ona görə də Uca Allah möminlər barəsində belə buyurur: **“Möminlər dedilər: “Ey Rəbbimiz, unutsaq və ya xəta etsək bizi cəzalandırma!”** (Bəqərə, 286)

Uca Allah *möminlərin bu duasından sonra* peyğəmbərinin dili ilə onlara belə demişdir: **“İstədiyinizi yerinə yetirdim.”**[1]

---

[1] Muslim, 200, 126. Muslim “Səhih” əsərində “İman” kitabının “Pak və Uca Allahın bəndələrini yalnız qüvvələri çatdığı qədər mükəlləf etməsinin bəyan olunması” fəslində bu hədisi belə qeyd edir: İbn Abbas ﵄ demişdir: “(Allahın): **“Siz içərinizdə olanı üzə çıxarsanız da, gizlətsəniz də Allah buna görə sizi hesaba çəkəcək”** (“əl-Bəqərə” surəsi, 284) ayəsi nazil olduqda, (hələ) səhabələrin qəlblərinə girməyən bir şey bu səbəbdən onların qəlbinə girdi. (Bu ayədən sonra səhabələrin qəlbləri təşvişə düşdü və onlar elə güman etdilər ki, qəlblərindən keçən hər bir şeyə görə haqq-hesaba çəkiləcəklər.) Onda Peyğəmbər ﷺ buyurdu: “Deyin: “Eşitdik, itaət etdik və qəbul etdik!” (Beləliklə də) Allah imanı onların qəlbinə yerləşdirdi, sonra da bu ayəni nazil etdi: **“Allah hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər mükəlləf edər. Hər kəsin qazandığı *xeyir yalnız* onun özünə, qazandığı *şər də yalnız* öz əleyhinədir. “Ey Rəbbimiz, unutsaq və ya xəta etsək, bizi cəzalandırma!”** (“əl-Bəqərə” surəsi, 286).

Allah: “İstədiyinizi yerinə yetirdim”– dedi.

**“Ey Rəbbimiz, bizdən əvvəlkilərə yüklədiyin kimi, bizə də ağır yük yükləmə!”** (“əl-Bəqərə” surəsi, 286).

Allah: “İstədiyinizi yerinə yetirdim”– dedi.

**“...bizi bağışla və bizə rəhm et! Sən bizim Himayədarımızsan!”** (“əl-Bəqərə” surəsi, 286).

Allah: “İstədiyinizi yerinə yetirdim”– dedi.

Başqa bir səhih hədisdə Peyğəmbər ﷺ demişdir: “Əgər hakim hökm verdiyi zaman ictihad etsə, sonra da verdiyi hökm düz çıxsa, iki savab qazanar. Əgər hökm verdiyi zaman ictihad etsə, sonra da verdiyi hökm səhv olsa, bir savab qazanar.”[1]

Həmçinin kim yaxşı bir əməli niyyət edib onu həyata keçirməyə səy göstərsə, lakin xəstəlik, səfər, acizlik və ya digər maneələr ucbatından həmin əməli etməyə müvəffəq olmazsa həmin əməli etmiş kimi ona savab yazılar.

Buxarinin “Səhih” əsərində Əbu Musadan ؓ Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “(Mömin) bəndə xəstələndiyi və ya səfərdə olduğu zaman ona evində, həm də sağlam olarkən etdiyi əməllərin savabı qədər savab yazılır.”[2]

Yaşlanması səbəbindən əməlləri edə bilməyən kəs də buna aiddir.

## İmanın artıb azalması fəsli

Quran və Sünnədəki dəlillər əsasında bizlərə iman sözünün mənası – yəni iman İslam qanunlarının toplumudur – onun əsasları, ehsanın mahiyyəti, bunlarla əlaqəli olan dinin digər məsələləri, hətta imanın ümumilikdə dinə şamil olunduğu aydın olduqdan sonra bilmək olur ki, iman artıb azalır, güclənib zəifləyir.

Bu məsələ istər şəri, istər hissi, istərsə də reallıq baxımından heç bir vəchlə şübhə qəbul etmir.

---

[1] Buxari, 7352; Muslim, 1716; Əbu Davud, 3574; Nəsai, 5918; İbn Macə, 2314; Əhməd, 4/197.

[2] Buxari, 2996; Əbu Davud, 3091; Əhməd 4/410, 418.

Çünki Quran və Sünnədə imanın artıb azaldığını sübut edən açıq-aydın dəlillər vardır.

Misal üçün Uca Allah buyurur:

**"Möminlərin imanı üstünə iman artırmaq üçün onların qəlbinə rahatlıq göndərən Odur."** (əl-Fəth, 4)

**"Biz Cəhənnəm gözətçilərini yalnız mələklərdən etdik və onların sayını** ***on doqquz*** **etdik ki,** ***bu,*** **kafirlər üçün ancaq bir sınaq olsun, özlərinə Kitab verilənlər yəqinlik hasil etsinlər, iman gətirənlərin imanı artsın."** (əl-Müddəssir, 31)

**"*Bəzi* adamlar onlara: "Camaat sizə qarşı *ordu* toplayıbdır, onlardan qorxun!"– dedilər. Bu, onların imanını daha da artırdı və onlar: "Allah bizə yetər. O nə gözəl Qoruyandır!"– dedilər."** (Ali İmran, 173)

**"Bir surə nazil edildiyi zaman onlardan *istehza ilə*: "Bu, hansınızın imanını artırdı?"– deyənlər də var. İman gətirənlərə gəldikdə isə, *o surə* onların imanını artırır və onlar bir-birlərini müjdələyirlər."** (Tövbə, 124)

Beləcə bir çox ayələri misal göstərmək olar.

Həmçinin hiss və reallıq baxımından da insanların imanlarının artıb azalması aşkardır. Belə ki, insanlar iman elminin, əxlaqi keyfiyyətlərin, zahiri və batini əməllərin çox və güclü olması baxımından, habelə həmin əməllərdə imanın əlamətlərinin və maneələrinin olub-olmamağı baxımından bir-birilərindən kəskin şəkildə fərqlənirlər. Kamil möminlərdə iman elmlər, mərifəti və əməlləri sıravi möminlərə nisbətdə daha təfsilatı ilə olur. Habelə kamil möminlərin əməlləri və əxlaqları da bu şəkildədir. Deməli əksər adi möminlərdə iman elmi zəif və qısa, əməllər isə az və çox zəif olur.

Adi möminlərin çoxunun yiyələndikləri biliklərdə vaxtaşırı müxtəlif ziddiyyətlər, şübhələr və nəfsi istəklər olur ki, bunlar da nəticə etibarı ilə imanın azalmasına və dərəcələrinin aşağı düşməsinə səbəb olur. Hətta bəzən elə olur ki, möminlər iman elmlərindən öyrəndikləri müəyyən bir elmdə belə müxtəlif səviyyədə olurlar:

Birinci: Bəziləri həmin elmi mükəmməl bir şəkildə qavrayır və bu barədə onlarda heç bir şəkk şübhə olmur.

İkinci: Digərlərinin isə bu barədə elmi zəif olur və imanını azaldan bir çox ziddiyyətlərə malik olur. İmandan irəli gələn əxlaqi dəyərlər də belədir. İnsanlar bu barədə də müxtəlif səviyyədə olurlar.

Misal üçün mülayimlik, səbir, əxlaq və bu kimi digər keyfiyyətlərdə insanlar müxtəlif səviyyədə olurlar. Hətta namaz kimi zahiri ibadətlərdə də bu belə olur.

Görürsən ki, iki nəfər eyni namazı qılır. Onlardan biri həmin namazın həm zahiri, həm də batini haqlarını verərək Allaha sanki Onu görürmüş kimi ibadət edir, çünki bilir ki, o Allahı görməsə belə Allah onu görür. Digərinin isə yalnız zahirən namaz qıldığı görünür, batini isə tamamilə başqa bir işlə məşğul olur. Digər ibadətlər də belədir.

Bu baxımdan möminlər üç mərtəbədə olurlar:

1 – *Xeyir işlərdə* bir-birini ötüb keçənlər.

2 – Orta mövqedə olanlar.

3 – Özlərinə zülm edənlər.

Hər bir mərtəbənin nümayəndələri də bir-birindən kəskin dərəcədə fərqlənirlər.

İnsanın elə vaxtları, elə halları olur ki, onun əməlləri çox və güclü olur, elə halları da olur ki bunun tam əksi olur. Bütün bunlar imanın artıb azalması, güclənib zəifləməsi səbəbindəndir.

Ümmətin ən xeyirli olanları və imanlarına daha çox önəm verənləri hər zaman imanlarını təzələməyə, onu daim artırıb gücləndirməyə, onu azaldan amillərdən uzaqlaşmağa səy göstərirdilər. Onlar həmişə Allahdan diləyirdilər ki, Allah onları iman üzərində sabit etsin, onun elm, əməl və hallarını artırsın.

Biz də Allahdan diləyirik ki, Ona olan etimadımızı, Onu zikr etməyimizi və sadiq imanımızı artırsın.

Həmçinin ümmətin ən xeyirli olanları yəqinlik elminə yiyələndikdən sonra yəqinliyin özünə və mahiyyətinə çatmaqdan ötrü bir-biri ilə yarışardılar.

Uca Allah İbrahim عليه السلام barədə buyurur:

**“Bir zaman İbrahim: “Ey Rəbbim, ölüləri necə diriltdiyini mənə göstər!”– dedi.** ***Rəbbi ona*****: “Məgər sən inanmırsan?”– dedi.** ***İbrahim*** **dedi: “Əlbəttə** ***inanıram!*** **Amma** ***istəyirəm ki,*** **qəlbim rahat olsun.”** ***Allah*** **buyurdu: “Quşlardan dördünü tut və onları özünə tərəf çəkib tikə-tikə et. Sonra hər dağın başına onlardan bir parça qoy, sonra da onları çağır, tez sənin yanına gələcəklər. Bil ki, Allah Qüdrətlidir, Müdrikdir!”** (əl-Bəqərə, 260)

Həmçinin buyurur: **“Beləcə, Biz, İbrahimə göylərin və yerin səltənətini göstərdik ki, yəqinliklə inananlardan olsun.”** (əl-Ənam, 75)

Həmçinin İsa Məsihin عليه السلام həvariləri Allah tərəfindən onlara bir süfrə göndərilməsini istəmiş İsa عليه السلام da onlara bu barədə tövsiyələr vermişdi. Uca Allah buyurur: **“Bir zaman həvarilər de-**

**mişdilər: “Ey Məryəm oğlu İsa! Rəbbin bizə göydən bir süfrə endirə bilərmi?” O da *onlara* demişdi: “Əgər möminsinizsə, Allahdan qorxun.” Onlar demişdilər: “Biz istəyirik ki, ondan yeyək, qəlblərimiz rahat olsun, bizə doğru söylədiyini bilək və o *möcüzəyə* şahidlik edənlərdən olaq.”** (əl-Maidə, 112-113)

Beləliklə onlar *süfrə istəməklə* özlərinin həm dünyəvi ehtiyaclarını, həm də elmə və imana olan ehtiyaclarını istəmişlər.

## İkinci fəsil
## İmanın nədən əxz edilməsi məsələlərinin bəyanı.

Bu çox faydalı bir fəsildir və ona böyük ehtiyac vardır. Hətta deyə bilərik ki, bu fəsli öyrənib bilmək və ona riayət etmək zəruridir.

Hər şeydən əvvəl bilmək lazımdır ki, iman insanın kamilliyidir və məhz imanın sayəsində o həm bu dünyada, həm də axirətdə yüksəlir. İman həm bu dünyada, həm də Axirətdə hər bir xeyrə nail olmaq üçün bir səbəb və bir yoldur. İmanın nədən əxz olunduğunu, mənbəyini, səbəblərini və yollarını bilmədən iman nə hasil olur, nə də güclənir. Uca Allah hər bir mətləbə çatmaq üçün bir səbəb və yol təyin etmişdir.

İman da insana gərəkən məsələlər arasında ən əhəmiyyətlisi, ən mühümü və ən geniş olanıdır. Rəbbimiz imana səbəb olub onu artıran, habelə onu azaldıb yox edən amillər yaratmışdır.

İmana səbəb olub onu artıran amillər iki növdür: İcmali və təfsilatı ilə olan.

İcmali olan növə gəlincə:

- Uca Allahın Quran və Sünnədə tilavət olunan ayələri barəsində düşünmək.

- Allahın kainatdakı müxtəlif növlü dəlilləri barədə düşünmək.

- Haqqı öyrənməyə can atmaq, hansı ki, insanlar məhz bunun üçün yaradılmışlar.

- Haqqa əməl etmək, əslində bütün səbəblər bu böyük əsasdan qaynaqlanır.

Təfsilatı ilə bəyan olunan növə gəlincə, iman bir sıra səbəblər vasitəsilə hasil olur və güclənir. Onlardan ən əzəmətlisi: Allahın Quran və Sünnədə varid olan gözəl adlarını bilmək, onların mənalarını dərk etməyə çalışmaq və bunun vasitəsilə Allaha ibadət etməkdir.

Buxari və Muslimin səhih əsərlərində Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: "Allahın doxsan doqquz - yüzdən bir əskik - adı var. Kim onları sadalasa, Cənnətə daxil olar."[1]

Yəni kim onların mənalarını dərk edərək onları əzbərləyərsə, onlara etiqad edərsə və onlar vasitəsilə Allaha ibadət edərsə Cənnətə daxil olar.

Məlum məsələdir ki, Cənnətə yalnız möminlər daxil olacaqlar. Bununla da aydın olur ki, bu, imanın hasil olması, onun güclənməsi və sabit olması üçün ən böyük səbəblərdəndir.

Allahın gözəl adlarını qavramaq imanın əsasıdır və iman da ona qayıdır. Onu bilmək tövhidin üç növünü özündə əhatə edir:

1 – Rübubiyyə tövhidi.

2 – Üluhiyyə tövhidi.

3 – Ad və sifətlərin tövhidi.

Bu növlər imanın ruhu, onun əsası və qayəsi hesab olunur. Mömin olan kəs nə qədər Allahın ad və sifətləri barəsində dərin elmə yiyələnmiş olsa bir o qədər imanı artar və yəqinliyi güclənər.

Odur ki, gərək mömin bacardığı qədər Allahın ad və sifətlərini öyrənsin və bu barədə olan bilikləri inkardan və bənzətmə-

---

[1] Buxari, 6410; Muslim, 2677; Tirmizi, 3506; İbn Macə, 3860; Əhməd, 2/258. Hədisi Əbu Hureyra رضي الله عنه rəvayət etmişdir.

dən uzaq olsun. Bidət əhlinin çoxu peyğəmbərin ﷺ gətirdiklərinə müxalif olaraq məhz bu xəstəliyə mübtəla olublar. Əksinə bu barədə elm yalnız Quran və Sünnədən, habelə səhabə və tabiinlərdən nəql olunan xəbərlərdən götürülməlidir.

Beləliklə bu faydalı elmə malik olmaqla insan imanının artmasına, yəqinliyinin güclənməsinə və əhvalının rahatlaşmasına səbəb olur.

**- İmanı artıran digər bir amil də ümumən Quran barəsində düşünməkdir.**

Quran barəsində düşünən kəs onun elmlərindən və biliklərindən nə qədər faydalanarsa bir o qədər də imanı artar.

Uca Allah buyurur: **"Möminlər ancaq o kəslərdir ki, Allah anıldığı zaman onların qəlbi qorxuya düşər, Onun ayələri onlara oxunduqda imanları artar, yalnız öz Rəbbinə təvəkkül edər."** (əl-Ənfal, 2)

Həmçinin Qurandakı ardıcıllığa, əhkamlara, ayələrin bir-birini təsdiq etməsinə, bir-biri ilə uyğun gəlməsinə, orada heç bir ziddiyyət və ixtilafın olmamasına nəzər salan kəs əmin olur ki, bu yenilməz hikmət sahibi və həmdi-sənaya layiq olan Allah tərəfindən nazil olunmuşdur, ona nə önündən, nə də arxasından heç bir batil nüfuz edə bilməz və əgər Allahdan qeyrisi tərəfindən göndərilmiş olsaydı içərisində çoxsaylı ixtilaflar və ziddiyyətlər olardı.

Uca Allah buyurur: **"Məgər onlar Quran barəsində düşünmürlərmi? Əgər o, Allahdan başqası tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ziddiyyət tapardılar."** (ən-Nisa, 82)

Bu da imanı gücləndirən amillərdən ən əzəmətlisidir və imanın bir çox cəhətdən qalxmasına səbəbdir.

Mömin bir kəs Allahın ayələrini sadəcə oxuyan kimi, oradakı dürüst xəbərləri və gözəl əhkamları öyrənərək imanını artırmış olur. Gör indi Quranı oxuyarkən ən gözəl bir tərzdə düşünərsə, onun məqsədlərini və sirlərini anlayarsa həmin şəxsin imanı necə artır?!

Ona görə də kamil möminlər Uca Allahın bu ayəsindəki kimi belə deyirlər: **“Ey Rəbbimiz! Həqiqətən, biz: “Rəbbinizə iman gətirin!”– deyə imana çağıran bir kimsənin çağırışını eşidib iman gətirdik.”** (Ali İmran, 193)

**- Peyğəmbərin ﷺ hədislərini öyrənmək də imanı artırır.**

Peyğəmbərin ﷺ hədislərini öyrənərək, oradakı iman barəsindəki elm və əməllərlə tanış olmaq da imanı hasil edən və onu artıran amillərdən hesab olunur.

İnsan Allahın kitabı və peyğəmbərinin sünnəsindən nə qədər çox elm alarsa onun imanı və yəqinliyi də bir o qədər artmış olar. Hətta ola bilsin ki, onun elmi və imanı yəqinlik mərtəbəsinədək qalxsın.

Uca Allah şəkk və şübhələri dəf edəcək güclü və tam bir elmə sahib olan elmdə qüvvətli olanları vəsf edərək onların malik olduqları elmin tam yəqinlik olduğunu bildirmişdir.

Məhz bu səbəbdən Uca Allah şübhə edənlərə və inkar edənlərə möminlərin ən hörmətli olanlarını, *elmdə qüvvətli olanlarını* nümunə göstərmişdir.

Uca Allah buyurur: **“Kitabı sənə nazil edən Odur. O Kitabın bir qismi mənası aydın ayələrdir ki, bunlar da Kitabın**

**anasıdır. Digərləri isə mənası aydın olmayan ayələrdir. Qəlblərində əyrilik olanlar fitnə-fəsad törətmək və istədikləri kimi yozmaq məqsədilə mənası aydın olmayanın ardınca düşərlər. Onun yozumunu isə Allahdan başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə deyərlər: "Biz onlara iman gətirdik, hamısı bizim Rəbbimizdəndir". Bunu isə ancaq ağıl sahibləri dərk edərlər."** (Ali İmran, 7)

Elmdə qüvvətli olanlar cahillikdən və şəkk-şübhələrdən uzaq olur, mənası aydın olmayan ayələri tərk edib, mənası aydın olan ayələri götürürlər. Sonra da onlar: "Biz onlara iman gətirdik, hamısı bizim Rəbbimizdəndir"- deyirlər. Uca Allahın ayələri, Onun kəlamları və verdiyi hökmlər doğru və haqdır.

Uca Allah buyurur: **"Lakin onlardan elmdə qüvvətli olanlar və möminlər sənə nazil edilənə və səndən əvvəl nazil olanlara inanır, namaz qılır, zəkat verir, Allaha və Axirət gününə iman gətirirlər."** (ən-Nisa, 162)

Həmçinin buyurur: **"Allah Özündən başqa *ibadətə layiq olan* məbudun olmadığına şahidlik etdi, mələklər və elm sahibləri də *şahidlik etdilər. Allah əbədi olaraq* ədalətli olmaqdadır. Ondan başqa *ibadətə layiq olan* məbud yoxdur, Qüdrətlidir, Müdrikdir."** (Ali İmran, 18)

Elm əhli Quran barəsində tam bir elmə malik olduqlarına və onlara səhih bir şəkildə iman gətirdiklərinə görə həm dünyada, həm də axirətdə şahid gətirilir.

Uca Allah buyurur: **"Bilik və iman nəsib edilmiş kimsələr isə (günahkarlara) deyəcəklər: "Siz *orada* Allahın yazısı ilə dirilmə gününə qədər qaldınız. Bu *gün,* məhz dirilmə günüdür, lakin siz *bunu* bilmirdiniz."** (Rum, 56)

Uca Allah bir çox ayələrdə bəyan etmişdir ki, Quranda yəqinliklə iman gətirən möminlər üçün əlamətlər vardır. Belə ki, Quranın ayələrini aramla oxuyub onun barəsində düşünməklə onlar Allahın dilədiyi qədər elm, yəqinlik və iman əldə etmiş olurlar. Bu minvalla onların elmləri, yəqinlikləri və imanları artmaqda davam edir. Beləliklə də Quran barəsində düşünmək imanı hasil edən və onu qüvvətləndirən ən böyük yollardan və vasitələrdən biri sayılır.

Uca Allah buyurur: **"*Bu* mübarək Kitabı, *insanların* onun ayələrini düşünüb anlaması və ağıl sahiblərinin də ondan ibrət götürməsi üçün sənə nazil etdik."** (Sad, 29)

Bu ayədə göstərilir ki, Quranın bərəkətini – bu bərəkətlərdən də ən mühümü olan imanı əldə etmək üçün ən başlıca yol onun ayələrini oxuyub, onlar barəsində düşünüb ibrət almaqdır. Həmçinin göstərilir ki, Quran barəsində düşünmək onu inkar edəni inkarından çəkindirir və dinə qarşı düşmən mövqe nümayiş edənin bu düşmənçiliyinə mane olur.

Uca Allah buyurur: **"Məgər *kafirlər* bu Söz haqqında düşünmürlərmi?"** (əl-Muminun, 68)

Yəni, əgər onlar Quranı düşünərək oxumuş olsaydılar bu onların küfrlərinə və *Quranı* təkzib etmələrinə son qoyar, Qurana iman gətirməyə və onu gətirənə tabe olmağa sövq edərdi.

Uca Allah buyurur: **"Xeyr! Onlar elmini qavraya bilmədikləri və hələ yozumu onlara gəlməmiş *Quranı* yalan hesab etdilər."** (Yunus, 39)

Yəni əgər onlar Quran elminə yiyələnmiş olsaydılar bu onların *Quranı* təkzib etmələrinə son qoyar və imanı onlara vacib edərdi.

**- İmanı hasil edən səbəblərdən biri də: Peyğəmbəri ﷺ tanımaqdır.**

Yəni Peyğəmbərin ﷺ necə ülvi bir əxlaqa və kamil vəsflərə malik olduğunu bilməkdir.

Çünki kim onu layiqincə tanıyarsa, onun gətirdiyi Quranın, Sünnənin və haqq dinin doğru olmasında heç bir şübhəyə düşməz. Uca Allah buyurur: **"Yoxsa onlar özlərinə göndərilmiş Elçini tanımayıb buna görə də onu inkar edirlər?"** (əl-Muminun, 69)

Yəni, Peyğəmbər ﷺ haqqında düşünüb daşınsaydılar bu onların dərhal iman gətirmələrinə, iman gətirmiş olanların isə imanlarının qalxmasına səbəb olardı.

Uca Allah insanları, Peyğəmbərinin ﷺ imana səsləyən halları barəsində düşünməyə təşviq edərək buyurur: **"De: "Mənim sizə yalnız bircə nəsihətim var; Allah üçün iki-iki, bir-bir ayağa qalxın, sonra da bir düşünün. Sizin dostunuzda heç bir dəlilik *əlaməti* yoxdur. O, şiddətli əzab gəlməzdən əvvəl sizi ancaq xəbərdar edəndir."** (Səba, 46)

Başqa bir ayədə Uca Allah bu peyğəmbərin ﷺ kamil bir insan və böyük bir əxlaq sahibi və məxluqatın ən xeyirlisi olduğunu bildirərək buyurur: **"Nun. And olsun qələmə və qələmə alınanlara! Məhz Rəbbinin mərhəmətinə görə sən dəli deyilsən. Şübhəsiz ki, sənin üçün tükənməz bir mükafat hazırlanmışdır. Həqiqətən də, sən böyük əxlaq sahibisən!"** (əl-Qələm, 1-4)

Məhz Peyğəmbər ﷺ tərifəlayiq vəsfləri, gözəl xüsusiyyətləri, dürüst və faydalı sözləri və yaxşı əməlləri sayəsində insanları

imana çağıran ən böyük dəvətçidir. İnsanlar üçün ən böyük rəhbər və ən kamil nümunə də odur. Uca Allah buyurur: **“Allahın Elçisi sizlərə – Allaha və Axirət gününə ümidini bağlayanlara və Allahı çox zikr edənlərə gözəl nümunədir.”** (əl-Əhzab, 21) Həmçinin buyurur: **“Peyğəmbər sizə nə verirsə, onu götürün, nəyi də qadağan edirsə, ondan çəkinin.”** (əl-Həşr, 7)

Uca Allah insanlar arasında xüsusi yerləri olan ağıl sahiblərinin dilindən buyurur: **“Ey Rəbbimiz! Həqiqətən, biz: “Rəbbinizə iman gətirin!”– deyə imana çağıran bir kimsənin çağırışını eşidib iman gətirdik.”** (Ali İmran, 193)

Burada **“...imana çağıran bir kimsənin...”** deyildikdə Peyğəmbər ﷺ nəzərdə tutulur. Yəni o, sözü, əxlaqı, əməli, dini və özünün bütün halları ilə bizi imana səslədi, biz də onun çağırışını qəbul etdik. Elə bir imana ki, orada heç bir şəkk-şübhəyə yer yoxdur.

Allahın ən çox sevdiyi əməl və insanı Allaha yaxınlaşdıran ən böyük vasitə məhz iman olduğuna görə ağıl sahibləri onun vasitəsilə təvəssül edərək günahlarının bağışlanmasını və onları ən yüksək məqama çatdırmalarını diləyərək belə dedilər: Uca Allah buyurur: **“Ey Rəbbimiz! Həqiqətən, biz: “Rəbbinizə iman gətirin!”– deyə imana çağıran bir kimsənin çağırışını eşidib iman gətirdik. Ey Rəbbimiz! Günahlarımızı bizə bağışla, təqsirlərimizdən keç və canımızı itaətkarlarla bir yerdə al!”** (Ali İmran, 193)

Buna görə də yalnız haqqı tapıb ona tabe olmaq istəyində olan insaflı adam Peyğəmbərin ﷺ sözünü eşidər-eşitməz imana tələsir, onun peyğəmbərliyinə şübhə ilə yanaşmır. Hətta əksər

insanlar onun üzünü görən kimi onun yalançı olmadığı qənaətinə gələrdilər.

Deyilənə görə birindən soruşurlar ki; "Peyğəmbərin ﷺ gətirdikləri ilə tanış olmamış nə üçün ona iman gətirməyə tələsdin?"

Həmin şəxs də cavabında dedi: "Elə bir şey yoxdur ki, onu Peyğəmbər ﷺ əmr etsin, insan ağlı isə kaş ki, bunu nəhy edərdi"- desin, yaxud bir şeyi nəhy etsin, insan ağlı isə kaş ki, bunu əmr edərdi"- desin."

Beləliklə də bu aqil insan Peyğəmbərin ﷺ şəriətinin gözəl və sağlam məntiqə uyğun olduğunu dəlil gətirmiş və buna görə də imana tələsmişdir.

Elə Rum imperatoru Herakla da Peyğəmbər ﷺ və onun buyurduğu əmr və qadağalar vəsf olunduqda onun ən möhtəşəm peyğəmbərlərdən biri olduğu qənaətinə gəlmiş və bunu aşkarcasına etiraf etmişdi. Lakin rəhbər olması və taxt-tacını itirmək qorxusu - peyğəmbərin haqq olduğu özlərinə bəlli olan bir çoxlarının tabe olmalarına mane olduğu kimi, ona da mane olmuşdu. Bu yuxarıda qeyd olunanlar iman gətirməyə ən böyük maneələrdəndir.

Bəsirət və sağlam düşüncə sahiblərinə gəlincə isə onlar bütün bu cür maneələrin, hökmdarlığın, şübhə və şəhvətlərin müvəqqəti olduğuna əmin olur, haqla ziddiyyət təşkil edən bu amillərin dəyərsiz olduğunu bilir və haqqın bu dünyada və Axirətdə insana səadət bəxş edəcəyini anlayırlar.

Elə bu böyük səbəbə görə də Quranı və səhih hədisləri öyrənib əzbərləyən kəslərin iman, yəqinlik və əməlləri adətən qeyrilərindən daha üstün olur.

**- İmanın hasil olma səbəblərindən biri də kainat barəsində düşünməkdir:**

Şübhəsiz ki, göylərin və yerin yaradılması, oradakı müxtəlif məxluqlar, insanın yaradılışı və onun malik olduğu sifətlər barədə düşünmək imanın artmasına səbəb olur. Çünki bu məxluqatın yaradılışının nə qədər əzəmətli olmasına nəzər salmaqla insan onları Yaradanın nə qədər qüdrətli və əzəmətli olduğunu, məxluqatın insanı heyrətləndirən və Allahın böyüklüyünə dəlalət edən dərəcədə dəqiqliklə yaradılmasını, Allahın rəhmətinin sübutu olan saysız hesabsız müxtəlif çeşiddə nemətlərin xəlq olunmasını bilməklə, insan öz Rəbbinə daha da təzim edərək şükür edir, Onu daim zikr edir, Ona ixlasla ibadət edir ki, bu da imanın ruhu və sirri hesab olunur.

Bütün məxluqatın, o cümlədən insanın özünün də hər cəhətdən Allaha möhtac olmasına nəzər salmaq da bu qəbildəndir.

Qeyd olunan məsələlər barəsində düşünmək insanı, Allaha olan mütiliyi kamilləşdirməyə, duaları çoxaltmağa, dini və dünyası üçün faydalı olan ehtiyaclarını mənimsəmək, habelə dininə və dünyasına zərər verən şeyləri də dəf etmək üçün Allaha boyun əyməyə məcbur edir. Həmçinin insanı məcbur edir ki, Rəbbinə olan təvəkkülü gücləndirsin, Onun vədinə olan inamını kamilləşdirsin və Onun yolunda yaxşı işlər görmək istəyini artırsın. Bütün bunların sayəsində iman həyata keçir və ibadətlər də güclənir. Çünki dua ibadətin özəyidir[1] və əsasıdır.

---

[1] Tirmizi bu hədisi "Duanın fəziləti barəsidə gələnlər" fəslində (3382) rəvayət etmiş və "bu hədis qəribdir"- demişdir. Albani hədisin bu ləfzini Daif əl-Cami əsərində (3003), həmçinin Mişkət əsərinin təxrici zamanı (2331) zəif saymışdır.

**- Həmçinin insanların mütəmadi ehtiyacda bulunduqları Allahın müxtəlif nemətləri barədə düşünmək də imanı artıran amillərdəndir.**

Uca Allah Öz Rəsulunu və möminləri şükür etməyə çağıraraq buyurur: **"Ey iman gətirənlər! Sizə ruzi kimi verdiyimiz pak şeylərdən yeyin və əgər Allaha ibadət edirsinizsə, Ona şükür edin! "** (Bəqərə, 172)

Beləkilə, iman insanı şükür etməyə sövq edir, şükür etməklə isə insanın imanı artır. Deməli bunların hər ikisi bir-birinə gərəklidir və bir-biri ilə sıx bağlıdır.

**- İmanı artıran amillərdən biri də insanın hər vaxt Allahı zikr etməyi çoxaltmasıdır.**

İbadətin özəyi olan dua və Allahı zikr etməklə insanın qəlbində iman ağacı əkilmiş olur, sonra bunların vasitəsilə o böyüyüb inkişaf edir. İnsan Allahı nə qədər çox zikr etsə bir o qədər imanı  artar.

İman da insanı çoxlu zikr etməyə sövq edir. Çünki Allahı sevən kəslər Onu çox zikr edir, Allahı sevmək isə imanın hasil olma səbəblərindəndir.

**- İmanın hasil olmasına gətirib çıxaran səbəblərdən biri də dinimizin gözəlliklərinə bələd olmaqdır.**

Şübhə yoxdur ki, İslam dini bütünlüklə gözəlliklərdən ibarətdir. Əqidəsi ən səhih, ən düzgün və ən faydalı, əxlaqı ən təri-

fəlayiq və ən gözəl, əməl və hökmləri isə ən yaxşı və ən ədalətli olanıdır.

Bu böyük səbəblərə görə də Allah imanı insanın qəlbində gözəlləşdirir və onu insana sevdirir. Odur ki, Uca Allah imanı məxluqatın ən xeyirlilərinə bəxş etmişdir. Uca Allah buyurur: **"Lakin Allah sizə imanı sevdirmiş, onu qəlbinizə gözəl göstərmiş, sizdə küfrə, günaha və asi olmağa qarşı nifrət oyatmışdır."** (əl-Hucurat, 7)

Beləliklə qəlbdəki iman ən gözəl və ən sevimli nemət sayılır.

İnsan bunun vasitəsilə imanın ləzzətini dadmış olur və bunu hiss edir. Onun batini, imanın həqiqəti və əsasları ilə, bədən üzvləri isə imanın əməlləri ilə gözəlləşir.

Peyğəmbərdən ﷺ rəvayət olunan hədisdəki duada belə deyilir: "Allahım! Bizi imanın gözəlliyi ilə gözəlləşdir və bizi doğru yolda olan başçılardan et."[1]

**- İmanı gücləndirən ən böyük amillərdən biri də həm Allaha ibadətdə, həm də insanlarla davranışda Ehsan məqamına nail olmağa çalışmaqdır.**

İnsan Rəbbinə ibadətdə ehsan mərtəbəsinə nail olmaq üçün Allaha sanki Onu görürmüş kimi ibadət etməlidir. İnsan ibadət edərkən Allahı görə bilməsə belə bilməlidir ki, Allah onu müşa-

---

[1] Əhməd, 4/264; Nəsai, 3/55; Hakim, 1/524. Albanibu hədisi "Mişkət" əsərində səhih saymışdır (2497). Hədisi Ammar ibn Yasir ؓ rəvayət etmişdir. Hədisin əvvəli bu dua ilə başlayır: "Allahım! Qeybi bilməyinlə və yaratma qüdrətinlə yaşamağın mənim üçün xeyirli olduğunu bildiyin qədər məni yaşat...".

hidə edir və onu görür. Odur ki, həmin şəxs etdiyi əməli kamilləşdirməyə və düzgün şəkildə yerinə yetirməyə çalışmalıdır. Bu uca məqama çatmaqdan ötrü isə mömin o qədər çalışmalıdır ki, sonda onun imanı və yəqinliyi güclənsin. Bu zaman o, yəqinliyin ən yüksək pilləsi olan "həqqul yəqin" məqamına çataraq itaətlərin ləzzətini dadmış, davranışlarının səmərəsini tapmış olur ki, bu da kamil iman sayılır.

**Həm sözlə, həm də əməllə insanlara yaxşılıq etmək də buna aiddir.**

Şübhəsiz ki, mal-dövlət, şan-şöhrət və digər mənfəətlər kimi xüsusiyyətlər imandandır və imanın yaranmasına səbəb olan əməllərdəndir. Şübhə yoxdur ki, mükafat və ya cəza edilən əməlin növünə uyğun olur. Ona görə də var-dövlət sahibi imkanı çatdığı qədər Allahın qullarına yaxşılıq etdiyi kimi, Allah da ona yaxşılıq edər.

Bu xeyirxahlıqların da ən əfzəllərindən biri yaxşı işlər görməyə can atmaq, bu məsələdə ixlaslı olmaq və bununla Uca Allaha yaxınlaşmaqdır. Mömin bunları etməklə Allah və Onun bəndələri üçün edilən nəsihəti yerinə yetirmiş olur. Çünki din nəsihətdir. Kim Allaha edilən ibadətdə və insanlarla rəftarında bu ehsan mərtəbəsinə müvəffəq olarsa həmin nəsihəti layiqincə etmiş olur.

Bu barədə Peyğəmbər ﷺ demişdir: "Biriniz özü üçün istədiyini (müsəlman) qardaşı üçün istəmədikcə iman etmiş olmaz."(Hədisi Buxari və Muslim rəvayət etmişdir.)[1]

---

[1] Bu hədisin təxricini öndə qeyd etmişik.

Həmçinin Uca Allah buyurur: **“Möminlər, həqiqətən də, nicat tapmışlar; o kəslər ki, namazlarında mütidirlər, o kəslər ki, sözbazlıqdan qaçırlar, o kəslər ki, zəkat verirlər, o kəslər ki, öz cinsi orqanlarını *həmişə* qoruyurlar, zövcələri və sahib olduqları cariyələr istisnadır. Onlar *buna görə heç* qınanmazlar. Bundan artığına can atanlar isə həddi aşanlardır. O *mömin* kəslər ki, əmanətlərini və vədlərini qoruyurlar. O kəslər ki, namazlarını öz vaxtlarında qılırlar. Məhz onlar – varis olanlardır.O kəslər ki,Firdovs cənnətinə varis olacaqlar ;onlar orada əbədi qalacaqlar.”** (əl-Muminun, 1-11)

Bütün bu sadalanan səkkiz amil imanı artırır, onun vəsflərindən sayılır və onun açıqlaması hesab olunur.

Namazda qəlbin iştirak etməsi, insanın özü ilə mübarizə apararaq söz və əməllərinə, qiraətinə, zikr və dualarına, qiyamına, rukusuna və səcdəsinə fikir verməsi imanı artıran səbəblərdən hesab olunur.

Öncə qeyd etmişdik ki, Uca Allah namazı iman adlandırmışdır. O buyurur: **“Allah sizin imanınızı puç etməz.”** (əl-Bəqərə, 143)

Uca Allah həmçinin buyurur: **“Kitabdan sənə vəhy olunanları oxuyub namaz qıl. Həqiqətən, namaz çirkin və yaramaz işlərdən çəkindirir. Allahı yada salmaq isə *ibadətlərin* ən əzəmətlisidir. Allah nə etdiklərinizi bilir.”** (əl-Ənkəbut, 45)

Doğrudan da namaz insanı imanın əksi olan hər bir çirkin və yaramaz işlərdən çəkindirən ən böyük ibadətdir. Bununla yanaşı namaz Allahı zikr etməkdən ibarətdir ki, bu da imanı qidalandıraraq onun artmasına səbəb olur. Buna görə də ayənin sonunda Uca Allah : **“Allahı yada salmaq isə *ibadətlərin* ən əzəmətlisidir.”**– deyə buyurur.

**Zəkat** da eyni qaydada imanı inkişaf etdirib onu qaldırır. Burada həm fərz olan zəkat, həm də müstəhəb olan sədəqə nəzərdə tutulur. Peyğəmbər ﷺ bu barədə demişdir: "Sədəqə bir dəlildir.[1]"[2]

Yəni sədəqə sahibinin imanına dəlildir. O, imanı artıraraq onu inkişaf etdirir.

**Boş-boş söhbətləri tərk etmək** də imandan hesab olunur. Boş-boş söhbətlər dedikdə bura hər bir xeyirsiz sözlər və hər bir xeyirsiz əməllər daxildir. Gərək insan hər zaman xeyirli sözlər söyləsin və hər zaman xeyirli əməllər etsin. Həmçinin şər sözləri və əməlləri tərk etsin. Şübhə yoxdur ki, bunların hamısına əməl etmək imandandır və bu imanı artırır və bəhrələndirir. Bu səbəbdən bəzən səhabələr və onların ardınca gələnlər özlərində bir passivlik hiss etdikdə bir-birlərinə deyirdilər ki; "Gəl bir saat iman gətirək." Bunu deyib onlar Allahı zikr edir, Onun dini və dünyəvi nemətlərini xatırlayırdılar ki, bunun sayəsində imanları yenilənsin.

---

[1] Yəni o, sahibinin səmimi olmasına dəlildir. Çünki mömin sədəqə verməklə Allaha yaxınlaşmaq və bunun sayəsində də savab qazanmaq istəyir. Beləliklə də, o, özünə əziz olan bir şeyi ona daha əziz olan Allahın yolunda sərf etmiş olur. Bu da onun imanının təmiz olduğuna dəlalət edir.

[2] Muslim, 223; Tirmizi, 3512; Nəsai, 5/5; İbn Macə, 280; Əhməd, 5/342. Hədisi Əbu Malik əl-Əşari ؓ rəvayət etmişdir. Hədis tam olaraq belədir: "Təmizlik imanın yarısıdır. Əlhəmdulillah tərəzini doldurur. Subhanəllah vəlhəmdulillah göylərlə yer arasını doldururlar. Namaz bir nurdur. Sədəqə bir dəlildir. Səbir bir işıqdır. Quran isə sənin ya lehinə, ya da əleyhinə bir hüccətdir. Hər bir insan səhər (evindən çıxıb iş dalınca gedər və) nəfsini satar; kimisi onu azad edər, kimisi də onu məhv edər."

**Pis əməllərdən çəkinmək**, ələlxüsus da zinadan uzaq olmaq imanın artmasına səbəb olan ən böyük səbəblərdən biridir. Beləcə mömin olan kəs Rəbbinin hüzuruna gələcəyindən qorxduğu üçün nəfsinə ehtirası yasaq etmişdir ki, bunun sayəsində imanı hasil edib onu artırsın.

**Əmanətləri və əhdləri qorumaq** da imanın əlamətlərindəndir. Peyğəmbər ﷺ demişdir: "Əmanəti olmayanın imanı da yoxdur."[1]

Əgər birisinin imanının və dininin hansı səviyyədə olduğunu öyrənmək istəsən onun bütün əmanət növlərinə, o cümlədən mal-dövlət, söz və əmanət hüquqlarına nə dərəcədə riayət etdiyinə nəzər sal. Gör o, özü ilə Rəbbi arasındakı, habelə özü ilə insanlar arasındakı hüquqlara, əhdlərə və sövdələşmələrə nə dərəcədə riayət edir.

Əgər bunlar öz qaydasındadırsa bil ki, onun dini və imanı da qaydasındadır. Yox əgər qaydasında deyilsə bil ki, bu naqisliyin miqdarı qədər onun dini və imanı da naqisdir.

Bir də namazları mühafizə edib vaxtlı-vaxtında və haqqını verərək qılmaqdır. Namazları vaxtında və layiqincə qılmaq iman üçün bostana axıdılan su tək önəmlidir. Həmin su bostanın inkişaf etməsinə və vaxtaşırı bar verməsinə səbəb olur.

İman ağacı da beləcə mütəmadi olaraq suvarılmalıdır. Bu da gün ərzində edilən ibadət və itaətləri mühafizə etməklə olur. Həmçinin iman ağacının dibini tez-tez ona zərər verə biləcək

---

[1] Əhməd, 3/135; Malik, 27; İbn Əbu Şeybə, 11/11; Əbu Nueymin "Huliyyə" əsəri, 3/220; Təbərani, 8/230; Beyhəqi, 6/288. Albani Mişkət əsərinin təxricində bu hədisə həsən hökmü vermişdir. "Mişkatul-Məsabih", 355. Hədisi Ənəs ﷺ rəvayət etmişdir.

daşlardan və kol-kosdan təmizləmək lazımdır ki, bu da həm sözdə, həm də əməldə haram işlərdən çəkinməklə olur.

Bütün bu sadalananlara nə zaman riayət edilərsə onda bostan da bolluca növbənöv məhsul verib inkişaf edər.

**- İmanı yaradan amillərdən biri də Allaha və Onun dininə dəvət etməkdir.**

İnsan haqqı və səbri tövsiyə etməklə, dinin əsaslarına dəvət etməklə, yaxşı işləri əmr edib pis işlərdən çəkindirmək kimi dini qanunlara davamlı əməl etməklə həm özü kamilləşir, həm də başqalarını kamilləşdirir.

Uca Allah Qurani Kərimdə axşam çağına and içir ki, dörd xüsusiyyətə malik şəxslərdən savayı bütün insanlar ziyan içindədirlər: insanı kamilləşdirən iman və saleh əməllər, faydalı elmdən və saleh əməllərdən sayılan haqqa və dinə tövsiyə etmək, bir də bütün bunlara səbir etmək və onu tövsiyə etməkdir ki, bununla da digərləri kamilləşmiş olur.

Ümumən Allahın yoluna dəvət edib, insanlara tövsiyələr vermək imanı gücləndirən əsas əlamətlərdəndir.

Allahın yoluna dəvət edən kəs bu dəvətin zəfər çalmasına çalışaraq dəvətini dəlil və sübutlarla əsaslandırmağa çalışmalıdır. Hər şeyin bir üsulu və metodu olduğu kimi imanın da üsul və metodu budur.

Həmçinin bilmək lazımdır ki, mükafat və ya cəza insanın etdiyi əməllərin növünə uyğun olur. İnsan da başqalarına nəsihət edib, onlara haqqı tövsiyə edərsə və bu yolda meydana çıxan bütün əngəllərə səbir edərsə, Allah tərəfindən ona nur, dəstək, güclü iman və təvəkkül əta ediləcəkdir.

İman gətirib Allaha təvəkkül etməklə insan həm insanlardan, həm də şeytanlardan olan düşmənlərinə qalib gəlmiş olur. Uca Allah bu barədə buyurur: **“Şübhəsiz ki, şeytanın, iman gətirib yalnız öz Rəbbinə təvəkkül edənlər üzərində heç bir hökmranlığı yoxdur.”** (Nəhl surəsi, 99)

Bundan savayı *Allahın dininə* dəvət edən şəxs haqqın qalib gəlməsinə çalışmış olur. Kim də bir şeyə can atarsa Allah onu ixlaslı və sadiq olduğu qədər elmdə və imanda müxtəlif nailiyyətlərə çatdırar.

**- İmanı gücləndirən digər mühüm bir amil imanla ziddiyyət təşkil edən bütün məsələlərə qarşı müqavimət göstərməkdir.**

Burada küfrlə nifaqın növləri, fasiqlik və asilik nəzərdə tutulur. Yəni imanın hasil olması üçün onu gücləndirən bütün amillərin mövcud olması şərt olduğu kimi, imana zidd olan bütün amillərin dəf olunması da gərəkdir. Həmin amillər də aşağıdakılardır:

1 – Günahlara son qoymaq və edilən günahlara da dərhal tövbə etmək.

2 – Bütün bədən üzvlərini haramlardan qorumaq.

3 – İman elmlərinə yiyələnərkən qarşıya çıxan, onu zəiflədən fitnəli şübhələrə və şəhvətlərə qarşı müqavimət göstərmək. Çünki yaxşı işlərə rəğbət bəsləyərək onları sevmək və bu istiqamətdə səy göstərmək kimi istəklər, yalnız onların əksi olan nəfsin pis iş görməyə rəğbət bəsləməsi kimi pis istəklərlə mübarizə aparmaqla mümkündür.

Beləcə insan nə zaman şübhə və şəhvətlərin toruna düşməkdən qorunarsa imanı kamil olar, yəqinliyi isə qüvvətlənər. Bu lap iman bostanına bənzəyir. Uca Allah buyurur: **“Mallarını Allahın razılığını qazanmaq və nəfslərini möhkəmləndirmək üçün xərcləyənlərin məsəli təpə üzərindəki bağın məsəlinə bənzəyir ki, ona şiddətli yağış düşdükdən sonra o öz bəhrəsini iki qat verər. Hərgah ona şiddətli yağış düşməzsə, narın yağış da *bəs edər*. Allah sizin nə etdiklərinizi görür.”** (əl-Bəqərə, 265)

Əks təqdirdə isə, yəni pis işləri əmr edən nəfs ona qalib gəldikdə şübhə və ya şəhvətlərin, ya da hər ikisinin fitnəsinə məruz qaldıqda aşağıdakı ayədə çəkilən məsəl ona şamil olunar. Uca Allah buyurur: **“Məgər sizlərdən biri istəyərmi ki, onun xurma ağaclarından və üzümlüklərdən ibarət, *ağacları* altından çaylar axan və içində də onun üçün hər cür meyvələr olan bir bağı olsun, *sonra da* ona qocalıq üz verdiyi zaman, özünün də *o bağa* möhtac olan uşaqları olduğu bir halda *bu bağa* odlu bir qasırğa düşüb *onu* yandırsın? Allah ayələri sizə belə bəyan edir ki, bəlkə fikirləşəsiniz.”** (əl-Bəqərə, 266)

**Uca Allahın müvəffəq etdiyi kəs iki şey üçün çalışır:**

**Birincisi:** İmanın əsaslarını və fəri məsələlərini elm, əməl və hal baxımından yaşamaq.

**İkincisi:** İmanla ziddiyyət təşkil edən, onu inkar edən və azaldan zahiri və batini fitnələri dəf etməyə çalışmaq. Beləcə birincidəki çatışmamazlıqları bərpa etmək, ikincidə isə buraxılan nöqsanlardan səmimi qəlbdən tövbə etmək lazımdır ki, lazımi iş vaxtında görülmüş olsun. Uca Allah buyurur: **“Allahdan**

**qorxanlara şeytandan bir vəsvəsə toxunduğu zaman *Allahı* xatırlayar və dərhal *gerçəyi* görərlər."** (əl-Əraf, 201)

Yəni onlar insanların ən qatı düşmənləri olan şeytanlardan gələn vəsvəsələr səbəbindən düçar olduqları çatışmamazlıqları və naqislikləri yaxşıca görürlər. Gördükdən sonra da bu çatışmamazlığı və fitnəni aradan qaldırır və beləliklə də əvvəlki kamil vəziyyətə qayıdırlar. Onların düşmənləri olan şeytanın dostları isə zəlil və məyus halda geri dönərlər. Uca Allah buyurur: **"*Şeytanlar* öz qardaşlarında azğınlığı artırarlar. Sonra da onlardan əl çəkməzlər."** (əl-Əraf, 202)

Şeytanlar durmadan onların səslərinə səs verən dostlarının azğınlığını artırmaq, onları həlaka məhkum etmək və onları xəsarətə uğratmaq istəyirlər.

Allahım! İmanı bizlərə sevdir, onu qəlbimizə gözəl göstər, bizdə küfrə, fasiqliyə və asiliyə qarşı nifrət yarat, bizi Öz fəzilətin və lütfünlə doğru yolda olanlardan et, həqiqətən də Sən elm və hikmət Sahibisən.

## Üçüncü fəsil
## İmanın faydaları və səmərələri

Düzgün imanın qəlb, bədən və rahatlıq üçün, habelə həm bu dünyada, həm də Axirətdə gözəl yaşayış üçün gec və ya tez neçə-neçə faydaları və səmərələri vardır.

Eləcə də bu iman ağacı bir çox yetişmiş meyvələrə, ləziz məhsula, daimi bara, davamlı xeyrə və bir sıra digər faydalara malikdir.

Əlqərəz, dünya və Axirətdə olan bütün xeyirlər, həmçinin bütün şərlərin dəf edilməsi bu ağacın səmərələrindəndir.

Belə ki, əgər bu ağac möhkəm olarsa, kökü güclənərsə, özü qol-budaq atarsa, budaqları şaxələnib bar verərsə gec-tez həm sahibinə, həm də qeyrilərinə bol-bol xeyir nəsib edəcəkdir.

**- İmanın ən böyük səmərəsi möminin Allahın xüsusi dostluğundan sevinc duymasıdır.**

Bunun uğrunda hamı bir-biri ilə yarışmalıdır və yalnız müvəffəq olanlar buna nail olurlar.

Uca Allah buyurur: **“Şübhəsiz ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar kədərlənməyəcəklər.”** (Yunus, 62)

Sonra da onları vəsf edərək buyurur: **“Onlar iman gətirmiş və *Allahdan* qorxmuşlar.”** (Yunus, 63)

Beləcə təqvalı olub Allahdan qorxan hər bir mömin Allahın xüsusi olaraq dostu sayılır.

İmanın digər səmərəsi haqqında Uca Allah buyurur: **“Allah iman gətirənlərin Himayədarıdır, onları zülmətlərdən nura çıxarır.”** (əl-Bəqərə, 257)

Yəni Allah möminləri küfrün zülmətlərindən iman nuruna, cahilliyin zülmətlərindən elm nuruna, günahın zülmətlərindən itaət nuruna, habelə qəflətin zülmətlərindən ayıq olma və zikr nuruna çıxarır.

Nəticə etibarı ilə Allah onları müxtəlif növlü pisliklərin zülmətlərindən çıxararaq dünya və Axirətdə olan xeyir nurlarına çatdırır.

Onlar bu uca məqama yalnız düzgün imanları, və bu imanı təqva vasitəsilə həyata keçirmələri sayəsində nail olmuşlar. Çünki təqva imanın kamilliyindəndir.

**- İmanın digər bir səmərəsi Allahın razılığını və Cənnətini qazanmaqdır.**

Uca Allah buyurur: **“Mömin kişilərlə mömin qadınlar bir-birinin dostlarıdır. Onlar *insanlara* yaxşı işlər görməyi buyurur, pis əməllərə qadağa qoyur, namaz qılır, zəkat verir, Allaha və Onun Elçisinə itaət edirlər. Allah onlara rəhm edəcəkdir. Həqiqətən, Allah Qüdrətlidir, Müdrikdir. Allah mömin kişilərə və mömin qadınlara *ağacları* altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağları və Ədn bağlarında gözəl məskənlər vəd etmişdir. Allahın razılığı isə daha böyükdür. Bu, böyük uğurdur.”** (Tövbə, 71-72)

Onlar Allahın razılığını, Onun rəhmətini və *Cənnətdə olan* gözəl məskənləri öz imanları sayəsində qazanmışlar. O iman ki,

onlar onun vasitəsilə həm özlərini, həm də qeyrilərini kamilləşdirərək Allaha və Onun rəsuluna itaət etmiş, insanları yaxşı işlərə dəvət edib pis işlərdən çəkindirmiş, bununla da ən yüksək məqamlara çatmışlar. Bu da Allahın lütfüdür.

**- İmanın faydalarından biri də kamil imanın, sahibini Cəhənnəm odundan qorumasıdır.**

Azacıq miqdarda da olsa belə iman, sahibini Cəhənnəmdə əbədi qalmaqdan qurtarır. Əgər birisinin imanı onu yalnız vaciblərə riayət edib, haramlardan çəkindirərsə o ümumiyyətlə Cəhənnəm oduna girməyəcəkdir. Bu barədə Peyğəmbərdən ﷺ saysız-hesabsız səhih hədislər nəql olunmuşdur.

Həmçinin Peyğəmbərdən ﷺ rəvayət olunmuşdur ki, qəlbində zərrə qədər imanı olan kəs Cəhənnəm odunda əbədi qalmayacaqdır.

**- İmanın səmərələrindən biri də odur ki, Allah onun sayəsində bütün xoşagəlməz şeyləri möminlərdən uzaqlaşdırır və onları hər növ çətinliklərdən qurtarır.**

Uca Allah buyurur: **“Şübhəsiz ki, Allah iman gətirənləri mühafizə edir.”** (əl-Həcc, 38)

Yəni möminləri hər bir xoşagəlməz işdən, insanlardan və cinlərdən olan şeytanlardan, düşmənlərdən və bədbəxt hadisələrdən  qoruyur, bədbəxt hadisənin qarşısını alır, o baş verdikdə isə həmin hadisəni onun üçün yüngülləşdirir.

Yunusun ﷺ başına gələn bəlalar haqqında Uca Allah buyurur: **"Sonra da zülmətlər içində yalvarıb demişdi: "Səndən başqa *ibadətə layiq olan* heç bir məbud yoxdur! Sən paksan, müqəddəssən! Mən isə, həqiqətən, zalımlardan olmuşam!"** (əl-Ənbiya,87). Sonra O, buyurur: **"Biz onun duasını qəbul etdik və onu qəm-qüssədən qurtardıq. Biz möminləri belə xilas edirik!"** (əl-Ənbiya, 88). Yəni bu minvalla Yunusu xilas etdiyimiz kimi möminləri də çətin vəziyyətlərdən xilas edirik.

Peyğəmbər ﷺ demişdir: "Çətinliklə üzləşən bir kəs qardaşım Yunusun duasını etsə Allah onu həmin çətinlikdən qurtarar. O belə dua etmişdi: Səndən başqa ibadətə layiq olan heç bir məbud yoxdur! Sən paksan, müqəddəssən! Mən isə, həqiqətən, zalımlardan olmuşam!"[1]

Uca Allah buyurur: **"Allahdan qorxana, *Allah* çıxış yolu göstərər və ona təsəvvürünə gətirmədiyi bir yerdən ruzi bəxş edər. Kim Allaha təvəkkül etsə, *Allah* ona kifayət edər."** (əl-Taləq, 2-3). Allahdan kim qorxarsa deyildikdə kim layiqincə iman gətirərsə nəzərdə tutulur. Allah da həmin şəxsə insanların ona verdiyi hər bir vəziyyətdən çıxış yolu göstərər. Sonra O, buyurur: **"Kim Allahdan qorxarsa, *Allah* onun işini asanlaşdırar."** (əl-Taləq, 4)

Beləliklə Allah təqvalı mömininin işlərini asanlaşdırır, onu ən asan olana müvəffəq edir, hər bir çətinliyi ondan uzaqlaşdırır, hər bir çətin işi ona asanlaşdırır, onu hər bir kədərdən qurtarır,

[1] Tirmizi, 3505; Nəsai "Əməlul-Yaumi vəl-Leyl", 656; Əhməd, 1/170; Hakim 1/505. Hakim bu hədisi "səhih" hesab etmiş, Zəhəbi də onun bu fikri ilə razılaşmışdır. Albani bu hədisi "səhih" hesab etmişdir. "Səhih ət-Tirmizi", 2785. Bu hədisi Səd ibn Əbu Vəqqas ﷺ rəvayət etmişdir.

hər bir sıxıntıdan ona yol göstərir və ona gözləmədiyi bir yerdən ruzi bəxş edir. Buna Quran və Sünnədə bir çox misallar vardır.

**- İmanın digər bir faydası da odur ki, iman və onun qolu olan saleh əməllər insana həm dünyada, həm də Axirətdə gözəl həyat bəxş edir.**

Uca Allah buyurur: **"Mömin olaraq yaxşı iş görən kişi və qadınlara, əlbəttə, gözəl həyat bəxş edəcək və etdikləri ən yaxşı əməllərə görə onları mütləq mükafatlandıracağıq."** (ən-Nəhl, 97)

İmanın xüsusiyyətlərindən biri də onun, qəlbi arxayınlaşdırması və rahatlaşdırması, onu Allahın ona verdiyi ruziyə qane etməsi, habelə qəlbi Allahdan başqasına bağlamamasıdır ki, bu da gözəl həyat adlanır. Əslində rahat həyat yalnız qəlbin rahat və arxayın olması və onun narahat olmaması ilə olur.

**- Digər bir faydası, bütün söz və əməllər onları edən insanın qəlbindəki iman və ixlasın olduğu miqdarda səhih və kamil sayılır.**

Bu səbəbdən Uca Allah hər bir əməlin əsasını təşkil edən bu şərti xüsusi olaraq qeyd edir.

Uca Allah buyurur: **"Kim mömin olduğu halda yaxşı işlər görsə, onun zəhməti inkar olunmaz. Şübhəsiz ki, Biz onun *əməllərini* yazırıq."** (əl-Ənbiya, 94)

Yəni onun zəhməti danılmaz, əməli puç olmaz və imanının gücünə görə əməli qat-qat artırılar.

Uca Allah həmçinin buyurur: **“Kim də Axirəti istəsə, mömin olaraq bütün qəlbi ilə ona can atsa, onların səyi məmnuniyyətlə qəbul olunar.”** (əl-İsra, 19)

Axirət üçün çalışmaq insanı Axirətə yaxınlaşdıran əməlləri yerinə yetirmək deməkdir. O əməllər ki, onları Uca Allah peyğəmbəri Muhəmmədin ﷺ dili ilə əmr etmişdir.

Əgər əməllər iman üzərində olarsa həmin səy məmnuniyyətlə qəbul olunaraq artar və ondan zərrə qədər belə itməz.

Yox əgər əməl imanla birlikdə olmazsa o zaman onu edən gecə-gündüz çalışıb yaxşı işlər görsə belə ondan qəbul olunmaz. Uca Allah buyurur: **“Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları sovrulmuş toz dənəciklərinə çevirərik.”** (əl-Furqan, 23)

Çünki həmin əməllər Allaha və Peyğəmbərə ﷺ iman üzərində qurulmamışdır. O iman ki, onun əsasını məbuda qarşı ixlaslı olmaq və peyğəmbərə tabe olmaq təşkil edir.

Uca Allah buyurur: **“De: “Sizə əməlləri baxımından ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi? O kəslər haqqında ki, onların dünya həyatındakı səyləri boşa çıxmışdır. Çünki onlar özlüyündə yaxşı işlər gördükləri gümanında idilər. Onlar Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını inkar edən, buna görə də bütün əməlləri boşa çıxan kimsələrdir. Odur ki, Qiyamət günü Biz onlara əhəmiyyət verməyəcəyik”.** (əl-Kəhf, 103-105)

Belə ki, onlar Allaha imanı tərk etdikdə, onun yerini Allaha və Onun ayələrinə qarşı küfr tutduğuna görə əməlləri boşa çıxmışdı.

Uca Allah buyurur: **“Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: “Əgər şərik qoşsan, əməlin puç olacaq və mütləq ziyana uğrayanlardan olacaqsan.”** (əl-Zumər, 65)

Həmçinin buyurur: **“Əgər *Ona* şərik qoşsaydılar, əlbəttə, etdikləri əməllər puç olardı.”** (əl-Ənam, 88)

Bu baxımdan imandan üz döndərmək insanın etdiyi bütün yaxşı əməlləri batil edir. Necə ki, onun əksi olan İslama və imana gəlməklə böyüklüyündən asılı olmayaraq insanın əvvəllər etdiyi bütün pis əməllər silinir. Əlavə olaraq imana zidd olan, ona xələl gətirən və onu naqisləşdirən bir günahdan tövbə etmək özündən qabaqkı əməlləri silib aparır.

**- İmanın daha bir faydası Allahın iman sahibini doğru yola yönəltməsi, onun da doğru yolda olmasıdır.**

Yəni Uca Allah iman sahibini haqqı bilib ona riayət etməyə yönəldir. Həmçinin insanı, başına sevindirici hadisə gəldikdə onu şükürlə, başına xoşagəlməz hadisələr və müsibətlər gəldikdə isə onu razılıq və səbirlə qarşılamağa yönəldir.

Uca Allah buyurur: **“İman gətirib saleh əməllər işlədənləri Rəbbi imanlarına görə doğru yola yönəldər.”** (Yunus, 9)

Həmçinin buyurur: **“Allahın izni olmadan *heç kəsə* bir müsibət üz verməz. Hər kəs Allaha iman gətirsə, Allah onun qəlbini haqqa yönəldər.”** (ət-Təğabun, 11)

Sələflərdən bəziləri bu ayənin təfsiri barəsində belə demişlər: “Bu o kəsdir ki, onun başına bir müsibət gəldiyi zaman bunun Allah tərəfindən olduğunu bilir, bundan razı qalır və bunu qəbul edir.”

**- İmanın çox önəmli bir faydası da ondan ibarətdir ki, o hər kəsin hər zaman başına gələ biləcək xoşagəlməz hadisə və müsibətlərdən insana təskinlik verir.**

İnsanda imanın və yəqinliyin daim olması ona müsibətlər zamanı təskinlik verir və bu müsibətləri onun üçün asanlaşdırır. Bu da onun güclü imana və qüvvətli təvəkkülə sahib olmasına, Rəbbinin savabını ummasına, Onun lütfünü diləməsinə görədir. Beləliklə də mükafatın şirinliyi səbrin acılığını aradan qaldırır.

Uca Allah buyurur: **"Əgər siz *döyüşdə* əziyyət çəkirsinizsə, onlar da siz əziyyət çəkdiyiniz kimi əziyyət çəkirlər. *Lakin* siz onların ummadıqlarını Allahdan umursunuz. Allah Biləndir, Müdrikdir."** (ən-Nisa, 104)

Buna görə də bəzən görürsən ki, biri imanlı, digəri isə imansız olan iki nəfər eyni və ya bir-birinə yaxın müsibətə mübtəla olurlar. Bu müsibət zamanı onların həm halları, həm də həmin müsibətin onların zahirlərində və batinlərində etdiyi təsiri bir-birindən kəskin şəkildə fərqli olur. Onların halındakı bu fərq imana və onun tələb etdiyi əməllərin yerinə yetirilməsinə qayıdır.

İman sahibi müsibət və xoşagəlməz hadisələr üz verdikdə təskinlik tapdığı kimi, sevdiklərini itirdikdə də təskinlik tapır. Odur ki, mömin olan kəs qəlbində həddən çox sevgi bəslədiyi yaxınlarını, övladını, mal-dövlətini, dostunu və digərlərini itirdikdə imanının şirinliyi sayəsində təskinlik tapır. Məlum məsələdir ki, iman insanın itirdiyi hər bir şeyin əvəzi ola bilər. Sevimli bir kəsin itirilməsi də əslində müsibətlərdən sayılır.

Əgər Yaqub عليه السلام çox sevdiyi oğlu Yusufu عليه السلام itirdiyi zaman başına gələn müsibəti onun üçün asanlaşdıra bilən güclü bir

imana sahib olmasaydı təskinlik tapmazdı. Bir zaman qardaşları ondan icazə istəmişdilər ki, Yusufu ﷵ da özləri ilə aparsınlar ki, oynayıb şənlənsin. Onda Yaqub ﷵ onlara dedi: **"Onu aparmağınız məni narahat edər."** (Yusuf, 12)

O, oğlanlarına xəbər verdi ki, Yusufu onlarla göndərməsinə mane olan başlıca səbəb onunla ayrılığa bir saat belə səbir edə bilməməsidir. Lakin oğlanları Yaqubu bu fikrindən daşındırdılar Yusufu onlarla göndərməsini vacib edən səbəbləri ona xatırlatdılar. Belə olduğu təqdirdə Yaqub Yusufu onlarla göndərdi ki, **"Allah olacaq işi həyata keçirsin".** (əl-Ənfal, 42)

Kimin ağlına gələr ki, vəziyyəti belə olan və oğlunu hədsiz dərəcədə sevən kəs uzun müddət buna tab gətirə bilsin?!

Əksinə insana elə gəlir ki, bu sevgi qısa bir müddət ərzində onun qəlbini parça-parça edəcəkdir. Lakin güclü bir imanı və Allaha olan ümidi sayəsində o, Allahın möminlərə vəd etdiyi kömək gələnədək bütün bunlara səbir etmişdi.

Musanın ﷵ anası da Musanı çaya qoyduqda onun qəlbi boşalmış və orada yalnız Musaya olan qəm-qüssədən başqa bir şey qalmamışdı. Əgər Allah onun qəlbinə iman verməsəydi və o, Allahın vədinin haqq olduğunu bilməsəydi az qala qəlbindəkiləri açıb başına gələn müsibəti hamıya deyəcəkdi. Lakin iman insanı çətin vaxtlarda sabit edir, ona müsibətlər üz verdikdə təsəlli tapmağa yardım edir və güclər tükəndikdə ona qüvvət verir.

Sünən əsərlərində İbn Abbasdan رضي الله عنهما səhih olaraq rəvayət olunan hədisdə Peyğəmbər ﷺ demişdir: "Firavan vaxtlarında Allahı tanı ki, O da səni çətin vaxtlarında tanısın."[1]

---

[1] Əhməd, 1/307; Beyhəqi "Şoəbil-İman" əsəri, 1043. Albani Təvəssül əsərində (səh. 38) bu hədisi səhih saymışdır. Həbisin əvvəli belədir: "İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ ona belə demişdir: "Ey oğlum! Allahı qoru ki, O da səni qorusun...".

Yəni varlı, sağlam və güclü olduğun halda Allaha iman gətirib onun əməllərinə riayət et ki, Allah da çətin vaxtlarında sənə yardım etsin, sənə qüvvət versin, çətinliyini aradan qaldırmağa kömək olsun. Möminin başına gələn ən böyük çətinlik isə ölüm və onun bihuşluğudur.

Bu hədis müjdədir ki, Allahı rahat vaxtında tanıyan kəsə, Allah həmin çətin anlarda, insanların rahatsız olduqları və güclərinin tükəndiyi vaxtlarda, habelə şeytanlar insanla onun xoş sonluğu arasında duraraq buna mane olduğu vaxtda yardım edəcəkdir. Şübhə yoxdur ki, həmin vaxt Uca Allah insanlara Öz köməyi və mərhəməti ilə yardım edir. Həqiqətən Allahdan başqa güc və qüvvət sahibi yoxdur.

**- İmanın faydalarından biri də Uca Allahın bu ayəsində buyurulanlardır: "İman gətirib yaxşı işlər görənlər üçün Mərhəmətli *Allah qəlblərdə* bir sevgi yaradacaq. Biz *Quranı* sənin dilinlə asanlaşdırdıq ki, onunla müttəqilərə müjdə verəsən və inadkarlara xəbərdarlıq edəsən."** (Məryəm, 96-97)

Yəni imanlarının və imandan irəli gələn əməllərinin sayəsində Allah onları sevir və möminlərin qəlbində onlara qarşı sevgi yaradır. Allahın və möminlərin sevdiyi kəs isə səadətə və nicata nail olar. Xüsusən də möminlərin məhəbbəti sayəsində onların tərifini, həm diri ikən, həm də öldükdən sonra dualarını, onların itaətini, dində onu rəhbər seçmələrini və bir çox faydaları qazanar.

Bu da imanın ən əzəmətli faydalarından biridir ki, Uca Allah imanlarını elm və əməllə kamilləşdirən möminlərə *gələcək nəsil-*

*lər həmişə yada salsın deyə* yaxşı ad qismət edir və Öz əmri ilə onlardan doğru yol göstərən rəhbərlər təyin edir.

Uca Allah buyurur: **“Səbir etdiklərinə və ayələrimizə yəqinliklə inandıqlarına görə Biz əmrimizlə onlardan doğru yolu göstərən rəhbərlər təyin etmişdik.”** (əs-Səcdə, 24)

Beləliklə imanın kamilliyi və zirvəsi sayılan səbir və yəqinliyin sayəsində onlar dində rəhbərliyə nail olmuşlar.

**- İmanın faydalarından biri də Uca Allahın bu ayəsidir:** **“Allah sizdən iman gətirənlərin və özlərinə elm verilmiş kimsələrin dərəcələrini ucaldır.”** (əl-Mücadilə, 11)

Uca Allah iman və elm sahiblərini həm bu dünyada, həm də axirətdə ucaldır və onlar bu dünyada və Axirətdə həm Allah yanında, həm də insanlar yanında məxluqatın ən xeyirliləri hesab olunurlar. Onlar bu yüksək məqama düzgün imanları, elmləri və yəqinlikləri sayəsində nail olurlar. Beləcə elm və yəqinlik imanın əsaslarındandır.

**- İmanın faydalarından biri də Allahın kəraməti ilə möminin Cənnətlə müjdələnməsi və hər bir cəhətdən əmin-amanlığın ona hasil olmasıdır.**

Uca Allah buyurur: **“Möminləri müjdələ!”** Bu ayə həm bu dünyada, həm də Axirətdə möminlərə veriləcək bütün xeyri ümumi olaraq özündə əhatə edir.

Xüsusi olaraq isə Uca Allah buyurur: **“İman gətirib saleh əməllər edənlərə müjdə ver ki, onlar üçün *ağacları* altından çaylar axan Cənnət bağları vardır.”** (əl-Bəqərə, 25)

Beləcə möminlər həm ümumi, həm də xüsusi müjdələrə layiqdirlər.

Həmçinin möminlərə ümumi əmin-amanlıq da verilmişdir. Uca Allah buyurur: **"İman gətirdikdən sonra imanlarına zülm qatışdırmayanları əmin-amanlıq gözləyir. Doğru yola yönəlmişlər də məhz onlardır."** (əl-Ənam, 82)

Əlavə olaraq möminlərə xüsusi əmin-amanlıq da verilmişdir. Uca Allah bu barədə buyurur: **"İman gətirib *əməllərini* islah edənlərin heç bir qorxusu yoxdur və onlar kədərlənməyəcəklər."** (əl-Ənam, 48)

Uca Allah möminlərin gələcəkdə baş verənlərdən qorxmayacaqlarını və keçmişdə baş verənlərdən də kədərlənməyəcəklərini bildirir. Beləliklə də möminlər tam əmin-amanlığa sahib olurlar.

Mömin olan kəs həm bu dünyada, həm də axirətdə tam əmin-amanlıq içində olur. Belə ki, O Allahın qəzəbindən və əzabından, habelə hər növ şərdən və xoşagəlməz hallardan salamat olur.

Onlar hər bir xeyirlə də müjdələnmişlər. Uca Allah buyurur: **"Dünya həyatında da, axirətdə də onlara müjdə vardır."** (Yunus, 64)

Aşağıdakı ayə bu müjdənin mahiyyətini açıqlayır: **"Həqiqətən də: "Rəbbimiz Allahdır!"– deyib sonra düz yol tutan kəslərə mələklər nazil olub *deyirlər:* "Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin! Biz dünya həyatında da, axirətdə də sizin dostlarınızıq. Orada sizin üçün nəfsinizin çəkə biləcəyi hər şey hazırlanmışdır. Orada istədiyiniz hər şey vardır."** (əl-Fussilət, 30-31)

Uca Allah həmçinin buyurur: **“Ey iman gətirənlər! Allahdan qorxun və Onun elçisinə iman gətirin! Onda O sizə Öz mərhəmətindən iki pay bəxş edər, sizə *düz yolla* getməyiniz üçün nur verər və sizi bağışlayar. Allah Bağışlayandır, Rəhmlidir.”** (əl-Hədid, 28)

Bu ayədə Uca Allah imanın savabını qat-qat artırdığını, mömin bəndənin həm bu dünyada, həm də axirətdə tam bir nura sahib olmasını təyin etmişdir. O nur ki, həm bu dünyada, həm də Axirətdə onun vasitəsilə gedirlər.

Uca Allah buyurur: **“O gün sən mömin kişilərin və mömin qadınların nurunun onların önlərindən və sağ tərəflərindən yayıldığını görəcəksən. *Onlara:* “Bu gün sizin müjdəniz *ağacları* altından çaylar axan Cənnət bağlarıdır. Siz orada əbədi qalacaqsınız!”– *deyiləcək.* Bu, böyük uğurdur.”** (əl-Hədid, 12)

Mömin olan kəs bu dünyada elminin və imanının nuru ilə gəzir. Qiyamət günü bütün nurlar söndükdə o sirat körpüsünün üzərindən öz nuru ilə keçərək Cənnətə daxil olacaqdır.

**- Uca Allah həmçinin məğfirəti də imana bağlamışdır.**

Günahları bağışlanılan şəxs əzabdan yaxa qurtarar və ən böyük savaba nail olar.

**- İmanın daha bir faydası möminin nicat tapmasıdır.**

Nicat tapmaq: məqsədlərə çatmaq, bütün qorxulardan salamatlıq və vəsilələrin ən şərəflisi olan hidayət deməkdir.

Uca Allah Muhəmmədə ﷺ nazil olan Qurana, ondan öncə nazil olanlara və qeybə iman gətirən, habelə imanın ən əzəmətli

əlamətlərindən olan namazı yerinə yetirən və zəkat verən möminlər barəsində buyurur: **“Onlar öz Rəbbindən *gələn* doğru yoldadırlar. Məhz onlar nicat tapanlardır.”** (əl-Bəqərə, 5)

Tam olaraq doğru yolda olmaq və kamil nicat tapmaq buna deyilir.

Beləliklə Allahın rəsullarına nazil etdiyi bütün kitablara və göndərdiyi bütün elçilərə tam bir yəqinliklə iman gətirməyincə insan hidayətə və nicata çata bilməz. Hidayət ən mühüm vasitə, nicat isə ən mühüm məqsəddir.

**- İmanın digər bir faydası moizələrdən, xatırlatmalardan və ayələrdən faydalanmaqdır.**

Uca Allah buyurur: **“Sən xatırlat! Çünki xatırlatmaq möminlərə fayda verir.”** (əz-Zariyat, 55)

Həmçinin buyurur: **“Şübhəsiz ki, bunda möminlər üçün dəlillər vardır.”** (əl-Hicr, 77)

Çünki iman, sahibini elmi və əməli surətdə haqqa riayət etməyə sövq edir. Belə ki, haqqa dəlalət edən moizələri və ayələri mənimsəmək üçün onun böyük vasitəsi və qabiliyyəti vardır. Haqqı qəbul edib ona əməl etməyə isə heç nə mane olmur.

Həmçinin iman fitrətin salamat qalmasını və məqsədin yaxşı olmasını vacib edir. Kimin halı belə olarsa, əlbəttə ki, ayələrdən faydalanar. Kimin də halı belə olmazsa, onda onun haqqı qəbul etməməsi və ona tabe olmaması qəribə sayılmaz.

Buna görə Uca Allah kafirlərin peyğəmbərləri təsdiq etmələrinə və onların gətirdikləri haqqı qəbul etmələrinə mane olan səbəbi qeyd edərək bildirir ki, bunun səbəbi onların qəlblərin-

dəki küfrdür. Çünki haqq aydındır, onun əlamətləri də açıq-aşkardır. Küfr isə insanın haqqa tabe olmasına ən böyük maneədir. Beləcə onların bu halı sizə qəribə gəlməsin, çünki bu hər bir kafirin xüsusiyyətidir.

**- İmanın digər bir faydası onun, sahibini xoş hallarda şükür etməyə, çətin vəziyyətdə səbir etməyə, hər zaman xeyir əldə etməyə sövq etməsidir.**

Səhih bir hədisdə Suheybdən ﵁ Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: "Necə qəribədir möminin halı, hər bir halı onun xeyrinədir. Əgər onun başına bir xeyir iş gəlsə o, buna görə şükür edər, bu da onun xeyrinə olar, yox əgər onun başına bir müsibət gəlsə, o buna görə səbir edər, bu da onun xeyrinə olar və bu yalnız mömin üçündür."[1]

Şükür və səbir hər bir xeyri özündə cəm edir. Mömin isə bütün vaxtlarında xeyir qazanır və hər bir halından qazanc əldə edir.

Başqa bir səhih hədisdə Peyğəmbər ﷺ demişdir: "Möminə üz vermiş elə bir kədər, elə bir dərd, elə bir əziyyət yoxdur ki, onun sayəsində Allah həmin möminin günahlarını bağışlamasın."[2]

---

[1] Hədisi Muslim rəvayət etmişdir, 2999.

[2] Buxari, 5641; Muslim, 2573; Əhməd, 2/303. Əbu Səid əl-Xudrinin və Əbu Hureyranın ﵄ rəvayət etdikləri ləfzdə isə belə deyilir: "Müsəlmana üz vermiş elə bir yorğunluq, elə bir naxoşluq, elə bir kədər, elə bir üzüntü, elə bir əziyyət, elə bir dərd, hətta (ayağına) batan elə bir tikan yoxdur ki, onun sayəsində Allah (həmin) müsəlmanın günahlarını bağışlamasın."

Beləliklə mömin firavanlıq və sevinc halında iki nemətə sahib olur:

1 – Sevdiyi şeyə nail olması neməti.

2 – Bundan da uca sayılan şükürə müvəffəq olması neməti. Beləcə onun üçün nemətlər tamamlanır.

Sıxıntı halında isə mömin üç nemətə sahib olur:

1 – Günahların kəffarə olunması neməti.

2 – Bundan da uca sayılan səbir mərtəbəsinə nail olma neməti.

3 – Sıxıntının ona asan gəlməsi neməti.

Çünki mömin əldə edəcəyi əcr və savabın nə qədər olacağını bildikdə və səbir nümayiş etdirdikdə müsibətin çətinlikləri onun üçün asanlaşmış olur.

**- İmanın daha bir faydası ondan ibarətdir ki, o bir çox insanların düçar olduqları və onların dinlərinə təsir etdiyi şübhələrdən insanı qoruyur.**

Uca Allah buyurur: **“Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən, sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə cihad edənlərdir! *İmanlarında* sadiq olanlar da məhz onlardır.”** (əl-Hucurat, 15)

Yəni onlarda olan düzgün iman bütün şəkk-şübhələri dəf edərək onları tamamilə yox edir. O, insanlardan və cinlərdən olan şeytanların, habelə pis işlərə əmr edən nəfslərin bütün şübhələrinə qarşı müqavimət göstərir.

Bu sağalmaz xəstəliklərin yeganə dərmanı imanın varlığıdır.

Buxari və Muslimin səhih əsərlərində Əbu Hureyradan ﵁ Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “İnsanlar bir-birilə-

rinə o qədər sual verəcəklər ki, axırda deyəcəklər: “Baxın, Allah məxluqatı yaratmışdır. Bəs Allahı kim yaratmışdır?” Kim *qəlbində* belə *vəsvəsələrdən* bir şey hiss etsə, qoy “Mən Allaha iman gətirmişəm.”- desin, *bu haqda düşünməyə* son qoysun və şeytandan Allaha sığınsın.[1]”[2]

Peyğəmbər ﷺ bu hədisdə sahibini həlak edən bu xəstəliyin faydalı dərmanını açıqlayır ki, bu da üç şeydən ibarətdir:

1 – Şeytanın bu vəsvəsələrinə son qoymaq.

2 – İnsanları azdırmaq üçün şübhə salan şeytanın şərindən Allaha sığınmaq.

3 – Səhih imana sarılmaq. Çünki ona sarılan həmişə əmin-amanlıqda olar.

Bu ona görədir ki, batil bir çox yollar vasitəsilə bəyan olur. Onların da ən başlıcası batilin haqqa zidd olmasını bilməkdir. Haqqa zidd olan hər bir şey isə batil hesab olunur. Uca Allah buyurur: **“Haqdan sonra zəlalətdən başqa nə ola bilər?”** (Yunus, 32)

**- İmanın daha bir faydası odur ki, o, hər bir insana üz verə biləcək sevinc, kədər, qorxu, əmin-amanlıq, günah və s. kimi amillərdən sığınacaq sayılır.**

Nemət və sevinc hallarında möminlər imana üz tutaraq Allaha şükür edərlər və onlara verilən bu nemətləri Allahın razı qaldığı şeylərə sərf edərlər.

---

[1] Yəni “Əuzu billəhi minəş-şeytanir-racim”- desin.

[2] Buxari, 3276; Muslim, 134. Buxarinin rəvayət etdiyi ləfzdə isə belə deyilir: “Şeytan sizdən birinizin yanına gəlib: “Filan şeyi kim yaradıb? Filan şeyi kim yaradıb?”– deyə (ayrı-ayrı suallar verməyə başlayır). Axırda da: “Rəbbini kim yaradıb?”– deyə (qəlbinizə şübhə salır). Belə olduqda qoy həmin adam Allaha sığınsın və bir daha bu haqda düşünməsin.”

Çətin və kədərli hallarda isə müxtəlif tərəflərdən imana tərəf yönəlirlər:

- İmanları və onun şirinliyi ilə təsəlli tapırlar.

- Bunlara səbir etməyin müqabilində əldə edəcəkləri savablara görə təsəlli tapırlar.

- Kədəri və təlaşı qəlb rahatlığı ilə qarşılayıb, hüzn və kədərə qarşı müqavimət göstərməklə xoş bir həyata qayıdırlar.

Bundan savayı qorxu zamanı imana yönələrək onunla rahatlıq tapırlar. Sonra da onların imanları, sabitlikləri, qüvvət və şücaətləri artır, onları bürümüş qorxu hissləri isə yox olur.

Uca Allah məxluqatın xeyirliləri barədə buyurur: ***"Bəzi* adamlar onlara: "Camaat sizə qarşı *ordu* toplayıbdır, onlardan qorxun!"– dedilər. Bu, onların imanını daha da artırdı və onlar: "Allah bizə yetər. O nə gözəl Qoruyandır!"– dedilər. Onlar özlərinə heç bir pislik toxunmadan, Allahın neməti və mərhəməti sayəsində geri döndülər və Allahın razılığına tabe oldular. Allah böyük lütf sahibidir."** (Ali İmran, 173-174)

Qorxu bu xeyirli insanların qəlbindən yox olmuş, onun yerini isə güclü iman və onun şirinliyi, Allaha güclü təvəkkül və onun vədinə inam tutmuşdu.

Əmin-amanlıq halında da möminlər imana tərəf yönəlir və təkəbbürlük göstərmirlər. Əksinə təvazökarlıq nümayiş etdirərək bunun Allah tərəfindən, Onun lütfü və asanlaşdırması sayəsində olduğunu bilir və bunun müqabilində Səbəbkara şükür edirlər. Onlar tam əmin olurlar ki, düşmənləri üzərində qələbəni öz gücləri sayəsində deyil, Allahın köməyi və gücü ilə qazanırlar.

Onlar itaət və yaxşı əməllər etdikdə də imana tərəf yönəlir və Allahın onlara əta etdiyi neməti etiraf edirlər. Onlar bilirlər

ki, Allahın onlara bəxş etdiyi bu nemət sağlamlıq və ruzidən daha önəmlidir. Həmçinin onlar həmin əməlləri kamilləşdirməyə, habelə həmin əməllərin qəbul olunmasına səbəb olan bütün şərtlərə riayət etməyə səy göstərirlər. Onları həmin əməli etməyə müvəffəq edən Allahdan diləyirlər ki, Uca Allah onların etdikləri savab əməllərini qəbul etməklə onlara verdiyi nemətini tamamlasın. Eləcə də bu nemətin əsasını onlara lütf edən Allahdan, naqis etdikləri əməllərin tamamlanmasını diləyirlər.

Həmçinin onlar hər hansı bir günah işə yol verdikdə tövbə etməyə tələsməklə, habelə yol verdikləri nöqsanı aradan qaldırmaq üçün yaxşı işlər görməklə imana tərəf yönəlirlər.

Uca Allah buyurur: **“Allahdan qorxanlara şeytandan bir vəsvəsə toxunduğu zaman *Allahı* xatırlayar və dərhal *gerçəyi* görərlər.”** (əl-Əraf, 201)

Əbu Səid əl-Xudrinin ﵁ rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ demişdir: “İmanla möminin məsəli (kəndirinin bir ucu yerə) mıxçalanmış ata bənzəyir, ora-bura hərəkət etməsinə rəğmən sonda öz mıxçasına tərəf qayıdır.”[1]

Mömin də beləcə bəzən qəflətdə olur və bəzi günahlara yol verir, sonra isə dərhal həyatını üzərində qurduğu imana tərəf qaytarır.

Beləliklə möminlər hər bir halda və vəziyyətdə imana tərəf yönələrək ona zidd olan məsələləri dəf edirlər ki, bu da Allahın onlara bəxş etdiyi bir fəzilət və lütfdür.

---

[1] Əhməd, 2/55; Beyhəqi “Şoəbil-İman” əsəri, 7/452. Albani “Mişkət” əsərinin təxricində bu hədisi səhih hesab etmişdir (4250).

**- İmanın daha bir faydası odur ki, səhih iman sahibini həlak edici əməllərdən qoruyur.**

Əbu Hureyranın ؓ rəvayət etdiyi hədisdə bildirilir ki, Peyğəmbər ﷺ demişdir: “Zina edən adam zina etdiyi vaxt mömin sayıla bilməz. Oğurluq edən adam oğurluq etdiyi vaxt mömin sayıla bilməz. Şərab içən adam onu içdiyi vaxt mömin sayıla bilməz...”[1]

Bu kimi əməllərə qurşanan şəxs onları imanının zəifliyindən, onun nurunun getməsindən və onu hər zaman görən Allaha qarşı olan həyasının yox olmasından dolayı edir. Bu da bəlli və müşahidə olunan bir haldır.

Düzgün və səhih iman insanı Allahdan həya etməyə, Onu sevməyə, Onun savabına ümid bəsləməyə, əzabından qorxmağa və zülmətin əksi olan nur əldə etməyə yönəldir.

İmanın kamilliyindən sayılan bu əməllər, şəkk yoxdur ki, sahibini hər bir xeyrə səsləyir və onu hər növ pislikdən qoruyur.

Hədisdə bildirilir ki, insan bu kimi pis əməllərə yol vermək istədikdə imanının nuru buna mane olur.

Sadiq imanla birlikdə olan nur, imanın şirinliyi və imanın mühüm şöbələrindən biri olan Allahdan həya etmək həmin pis əməlləri etməyə maneçilik törədir.

**- İmanın başqa bir faydası bu hədisdə qeyd olunur: Buxari və Muslimin səhih əsərlərində Əbu Musadan ؓ Peyğəmbərin ﷺ belə dediyi rəvayət olunur: “Quran oxuyan mömininin məsəli**

---

[1] Buxari, 2475; Muslim, 57; Əbu Davud, 4689; Tirmizi, 2625; Nəsai, 8/58; İbn Macə, 3936; Əhməd, 2/243.

**turuncun[1] məsəlinə bənzəyir. Onun dadı da xoşdur, iyi də xoşdur. Quran oxumayan möminin məsəli isə xurmanın məsəlinə bənzəyir. Onun dadı gözəldir, amma iyisi yoxdur."[2]**

Qeyd olunan bu iki qisim insanlar məxluqatın ən xeyirliləridir. Ümumiyyətlə isə insanlar dörd qismə bölünürlər:

1 – Həm özü xeyirli olan, həm də başqalarına fayda verənlər.

Ən xeyirli insanlar bunlardır. Quranı oxuyub, dini biliklərə yiyələnən mömin həm özünə fayda verir, həm də harada olmasından asılı olmayaraq başqaları üçün faydalı və mübarək bir şəxs hesab olunur. Uca Allah İsa ﷺ barəsində buyurur: **"Harada oluramsa olum, məni mübarək etdi."** (Məryəm, 31)

2 – Özü-özlüyündə xeyirli olan kəs.

Yəni başqalarına fayda verə biləcək elmə sahib olmayan möminlər.

Bu iki qisim, insanların ən xeyirliləridir. Onların sahib olduqları xeyir imanla əlaqəlidir. Möminlərin fərqli hallarından asılı olaraq onlar digərləri üçün də faydalı olurlar.

3 – Xeyri olmayan, lakin başqalarına ziyan da verməyən kəslər.

4 – Həm özünə, həm də başqalarına zərər toxunduran kəslər.

Bu da ən pis qisimdir. Uca Allah buyurur: **"Kafir olub *insanları* Allah yolundan sapdıranlara törətdikləri fitnə-fəsada görə əzab üstündən əzab artıracağıq."** (ən-Nəhl, 88)

Beləliklə hər bir xeyrin mənbəyi iman və ona aid məsələlərdir. Belə olduğu halda hər bir şərin əsası da imanın olmaması və imana zidd olan keyfiyyətlərə malik olmaqdır. Şübhəsiz ki, müvəffəq edən Allahdır.

---

[1] Xoş iyli sitrus meyvəsi.

[2] Buxari, 5427; Muslim, 797.

Buna bənzər mənada Peyğəmbər ﷺ demişdir: “Allah yanında güclü mömin zəif mömindən daha xeyirlidir, lakin onların hər birində xeyir vardır.”[1]

Bu hədisdə Peyğəmbər ﷺ möminləri iki qismə bölür:

1 – Əməlində, imanında və digərlərinə fayda verməkdə güclü olan mömin.

2 – Bu xüsusiyyətlərdə zəif olan mömin.

Lakin bütün bunlara baxmayaraq hər iki qisimdə xeyir vardır. Çünki hər bir halda möminlər imanlarına görə fərqli olsalar belə imanın varlığının özü bir xeyirdir.

İbn Ömərin رضي الله عنهما rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ demişdir: “İnsanlarla qaynayıb qarışaraq onların verdiyi əziyyətlərə səbir edən mömin, insanlarla qaynayıb qarışmayaraq onların verdikləri əziyyətlərə səbir etməyən mömindən daha xeyirlidir.”[2]

Bütün bu sadalanan səhih dəlillərdən bəlli olur ki, imanı olmayan kəsdə xeyir yoxdur. Çünki iman yoxdursa ya sahibinin hər bir əməli həm özü üçün, həm də cəmiyyət üçün pislikdən ibarət olacaq, ya da ki, müəyyən qədər xeyirli əməlləri olsa belə pis əməllərinin çoxluğu ona qalib gələcəkdir.

Çünki yaxşılıqlar pisliklərə qarışıb bulandıqda pisliklərə çevrilir və malik olduğu hər bir yaxşı əməlin qarşılığında bir pis əməl durur. Odur ki, qarşılıqlı olan xeyirlə şər əməlin hər ikisi silinir və yalnız qarşılığı olmayan şər əməllər qalır.

İnsanların real vəziyyətləri barədə düşünən kəs məsələnin Peyğəmbərin ﷺ buyurduğu kimi olduğunu görəcəkdir.

---

[1] Hədisi Muslim rəvayət etmişdir, 2664. Əbu Hureyranın رضي الله عنه rəvayəti.

[2] Tirmizi, 2507; İbn Macə, 4032; Əhməd, 2/43. Albani bu hədisi “Səhih əl-Cami” əsərində səhih saymışdır (6527).

# Son

Bütün bu qeyd olunanlardan anlaşılır ki, ən bərəkətli, ən faydalı və ən davamlı ağac iman ağacıdır.

Bu ağacın kökü, əsası və budaqları: iman, onun elmi və bilikləridir.

Bu ağacın gövdəsi və budaqları: İslam qanunları, saleh əməllər, Allaha ixlasla birlikdə olan gözəl əxlaqi dəyərlər, bir də Allahın Rəsuluna ﷺ tabeçilikdir.

Bu ağac mütəmadi olaraq bəhrə verir: gözəl məqsəd, düzgün hidayət, gözəl əxlaq, Allahı zikr edib Ona şükür və tériflər etmək, imkan dairəsində insanlara elmlə, nəsihətlə, bədənlə, şan-şöhrətlə, mal-dövlətlə və başqa şeylərlə yardım etmək onun bəhrələrindəndir.

Bütünlüklə iman ağacı Allahın və insanların bütün hüquqlarını ödəməyə şamil olunur.

Bu ağac möminlərin qəlbində onların bu vəsflərə nə dərəcədə yiyələnmələrinə görə müxtəlif formada olur və onların Axirətdə çatacaqları məqamlar bunun müqabilində olacaqdır.

İnsanları bütün bu fəzilətlərə müvəffəq etmək tək olan Allaha aiddir. Uca Allah buyurur: ***“Bilin ki,* əslində Allah sizi imana gətirməklə sizə mərhəmət göstərmişdir!”** (əl-Hucurat, 17)

Cənnət əhli ora daxil olduqdan və öz mənzillərində qərar tutduqdan sonra Allahın fəzilətini dilə gətirərək deyəcəklər: **“Onlar deyəcəklər: “Bizi buna qovuşduran Allaha həmd olsun! Əgər Allah bizə hidayət etməsəydi, biz özümüz doğru yola yönələ bilməzdik. Əlbəttə, Rəbbimizin elçiləri haqqı gətir-**

**mişdilər". Onlara *belə* xitab ediləcəkdir: "Əməlləriniz sayəsində varis olduğunuz Cənnət budur!"** (əl-Əraf, 43)

Bu ayədə bildirilir ki, möminlər Cənnətdə Allahın nemət və fəzilətini etiraf edərək Onu tərifləyəcəklər. Onlar Uca Allahın fəziləti, bir də etdikləri yaxşı əməllərin müqabilində bu uca məqamlara nail olacaqlar.

Uca Allahdan diləyirik ki, bizləri sadiq imana yönəltsin, bir göz qırpımı belə bizləri başlı-başına buraxmasın, bizi hidayət yoluna yönəltdikdən sonra qəlbimizi sapdırmasın, bizə Öz tərəfindən mərhəmət bəxş etsin. Həqiqətən O Bəxşedəndir.

Muhəmmədə, onun ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun.

Bu kitabın müəllifi Allaha möhtac bəndə Abdur-Rəhman ibn Nasir ibn Abdullah ibn Nasir əs-Sə'didir. Allah onu, valideynlərini və bütün müsəlmanları bağışlasın.

Hicrətin 1374-cü ili, Zil-hiccə ayının 8-i.

Aləmlərin Rəbbi olan Allaha həmd olsun.